PƏRVİZ AĞALAROV, NİYAMƏDDİN QULİYEV, KƏRƏM MƏMMƏDOV,
HAFİZ CABBAROV, TALIB TALIBLI, ELŞƏN QASIMOV,
RAMİL TANRIVERDİ, ELNUR HÜSEYNOV

*Ümumi təhsil müəssisələrinin* 7 *-ci sinifləri üçün*

# ÜMUMİ TARİX

*fənni üzrə*

**DƏRSLİK**



Bu nəşrlə bağlı irad və təkliflərinizi
**info@eastwest.az** və **derslik@edu.gov.az**
elektron ünvanlarına göndərməyiniz xahiş olunur.
Əməkdaşlığınız üçün əvvəlcədən təşəkkür edirik!



ŞƏRQ - QƏRB

# Mündəricat

## Dünya ölkələri III–XI yüzilliklərdə






Dərslikdəki **QR kodlara** müraciət edərək mövzu ilə əlaqədar daha çox maraqlı məlumat əldə edə bilərsiniz.

## Dünya ölkələri XI–XVI yüzilliklərdə



### Şərti işarələr


Sual


Tapşırıq


Maraqlıdır


Mənbə


Araşdırma

## Əziz məktəblilər!

Siz 6-cı sinifdə dünyanın ən qədim zamanlardan III–V yüzilliklərə qədər olan tarixi dövrü, ibtidai cəmiyyət, ilk dövlətlərin yaranması, quldarlıq münasibətləri, qədim Şərq sivilizasiyası və Antik mədəniyyət ilə tanış olmuşsunuz.

İndi 7-ci sinif Ümumi tarix fənninin öyrənilməsinə başlayırsınız. Bu fənn orta əsrlər tarixindən bəhs edir.

Bu dərslikdə feodal münasibətlərinin meydana gəlməsi, erkən feodal dövlətlərinin yaranması, siyasi pərakəndəliyin xüsusiyyətləri, mərkəzləşdirilmiş dövlətlərin meydana gəlməsi, kəndli üsyanları, işğalçılıq müharibələri, Böyük coğrafi kəşflər, Şərq və Qərb sivilizasiyalarının özünəməxsus cəhətləri öz əksini tapmışdır.

Bu mövzular ümumi tarixə dair sizin biliklərinizi daha da zənginləşdirəcək, dünyagörüşünüzü artıracaq, yeni tarixə keçid üçün baza olacaqdır.



# FEODAL MÜNASİBƏTLƏRİNİN MEYDANA GƏLMƏSİ

**Feod, feodal münasibətləri, təhkimli kəndli, feodal nərdivanı, senyor, biyar**

Feodalizmin ilk əlamətləri quldarlıq quruluşu daxilində yaranmağa başlamışdır. Orta əsrlərdə hərbi qulluq müqabilində verilən torpaq sahəsinə feod deyildiyindən yeni yaranan ictimai münasibətlər də feodalizm adlanır. Şərq ölkələrində feodal münasibətlərinin yaranması və inkişafı Avropadan fərqlənirdi. Quldarlığın bəzi qalıqları qorunub saxlanırdı. Tayfa münasibətləri hələ də qorunduğundan meydana gələn dövlətlər, adətən, coğrafi məkanla deyil, sülalə ilə tanınırdı.

Feodalların torpaq sahibliyinin **irsi** və **şərti** olmaqla iki forması var idi. İrsi torpaq sahibləri olan feodallar, əsasən, keçmiş quldarların nəsillərindən idi. Şərti torpaq sahibləri isə feodu qulluq müqabilində dövlətdən alırdılar. Onların bu torpaqları satmaq, bağışlamaq hüquqları yox idi. Suvarma sistemləri böyük xərc tələb etdiyindən feodalların şəxsi təsərrüfatları yox idi. Onlar gəlir əldə etmək üçün istər xüsusi mülkiyyətlərində olan, istərsə də qulluq qarşılığında aldıqları torpaqları kəndlilərə icarəyə verirdilər.

## Şərq feodalizmi

Şərqdə feodal münasibətlərə keçid dövründə cəmiyyətin əsas istehsal qüvvəsi azad kəndlilər idi. Suvarma sistemləri və əkinə yararlı torpaqlar dövlətə məxsus olduğundan yeni yaranan ictimai quruluş *dövlət feodalizmi* adlanırdı. Bu halda kəndlilərin əksəriyyəti vergini, bir qayda olaraq, dövlətə ödəyirdi.




**Dövlət feodalizmi nədir?**



*Çində feodal torpaqlarında çalışan kəndlilər*





*Avropada feodal torpağını becərən kəndli*

# Qərb feodalizmi

Avropada feodal münasibətlərinin yaranması Roma imperiyasının dağılması, qonşu xalqların hücumları və xristian dininin yayılması ilə müşayiət olunurdu. Nəticədə Qərbi Roma torpaqlarında yerləşən xalqlar öz dövlətlərini yaratdı. Əvvəlki tayfa başçıları krala çevrilir və ələ keçirdikləri torpaq sahələrini orada yaşayan kəndlilərlə birlikdə xidmət müqabilində keçmiş döyüşçülərinə verirdilər. Bu torpaqlar irsən keçirdi. Krallıqların əraziləri böyüdükcə paylanan torpaqların sahələri də genişlənirdi. Bu sahibkarlar torpaqlarını onlardan asılı olan vassallarına paylayırdılar. Nəticədə "feodal nərdivanı" deyilən bir sistem yaranır və feodal pərakəndəliyi artırdı.



**Şərq ilə Qərb feodalizminin oxşar və fərqli əlamətlərini müəyyən edin.**

| Şərq feodalizmi | | Qərb feodalizmi |
|---|---|---|
| fərq | oxşar | fərq |
| | | |



**Şəkillər (səh. 6-7) əsasında kəndlilərin həyat tərzi və məşğuliyyətlərini təsvir edib müzakirələr aparın.**

Bu "nərdivan"ın yuxarısında kral, ondan aşağıda hersoq və qraflar, sonra baronlar, sonuncu pilləsində isə cəngavərlər dayanırdı.

Aşağı pillədə olan feodal torpaq sahəsi aldığı və ondan yuxarıda olan feodala sədaqət andı içir və onun vassalına çevrilirdi. Yuxarı pillədə dayanan feodal aşağı pillədə dayananın senyoru sayılırdı.

"Feodal nərdivanı"na görə vassal ancaq senyorundan əmr ala bilərdi. Buna görə də Avropada belə bir ifadə yaranmışdı: "Vassalımın vassalı, mənim vassalım deyildir".



**"Feodal nərdivanı"nın əsas mahiyyəti nədir?**




Yepiskop Fulbertin vassal və senyorun qarşılıqlı öhdəlikləri haqqında Akvitaniya hersoquna məktubu





## Senyoruna sədaqət andı içən vassal 6 qaydanı yadda saxlamalıdır :

- Senyoruna bədən xəsarəti yetirə biləcək hərəkət etməməlidir;
- Onun sirlərini verməməli və qalalarının təhlükəsizliyinə xələl gətirməməlidir;
- Məhkəmədə senyorunun hüquqlarına zərər vuran addım atmamalıdır;
- Onun malikanəsinə ziyan vurmamalıdır;
- Senyorunun asanlıqla nail ola biləcəyi şeylərə mane olmamalıdır;
- Mümkün olanı çətinə çevirməməlidir.

Ədalətin də tələb etdiyi kimi ziyankar və etibarsız vassal feod almağa layiq deyil... Aldığı feoda layiq olmaq üçün vassal 6 öhdəlikdən başqa, həm də senyoruna məsləhətlər verməli, andına sadiq olmalıdır. Senyor da sədaqətli vassalına qayğı göstərməlidir.



**Mənbədə verilən qaydaları müzakirə edib nəticə çıxarın.**

Get-gedə artan feodal pərakəndəliyi ticarət əlaqələrinin daha da zəifləməsinə səbəb olurdu. Buna görə də ayrı-ayrı feodal mülklərində yaşayan sənətkarların düzəltdikləri məhsullar bazara çıxarılmaq üçün yox, orada yaşayan əhalinin tələbatını ödəmək üçün nəzərdə tutulurdu. Bu, **natural təsərrüfat** adlanırdı.

Feodalizmin ilk mərhələsində Avropa kəndliləri azad və təhkimlilərə bölünürdülər. Təhkimli kəndlinin feodalın yanından çıxıb getmək, hətta onun icazəsi olmadan evlənmək hüququ belə yox idi. Bəzi Avropa ölkələrində təhkimli kəndli hətta qul kimi alına və satıla bilərdi. Feodal münasibətləri inkişaf etdikcə azad kəndlilər də təhkimli halına salınırdılar.

**S** **Natural təsərrüfat ilə quldar təsərrüfatı arasında hansı fərqləri görürsünüz?**



**T** **Natural təsərrüfatın iqtisadi əlaqələrə təsirini müəyyən edin.**

*Kəndlilər biçində*

# Feodal kəndli münasibətləri

Feodalizm dövründə kəndlilərin əsas istismar vasitəsi **biyar** idi. Biyar ilin əvvəlcədən müəyyən edilmiş günlərində kəndlilərin öz iş heyvanları ilə torpaq sahibləri üçün havayı işləməsi idi. Kəndlilər bəzən həftənin 3 gününü biyara çıxmalı olurdular. Kəndlilərin istismarının digər forması torpaqdan istifadəyə görə alınan **məhsul vergisi** idi. Bu vergi bəzən məhsul töycüsü də adlandırılır. Kəndli becərdiyi məhsulun müəyyən bir hissəsini feodala və ya dövlətə ödəməli idi. Bu istismar forması uzun müddət davam etmişdir. Feodalizmin dağılması ərəfəsində məhsul vergisi **pul töycüsü** ilə əvəz olundu. Ticarət və sənətkarlığın inkişafı nəticəsində tədricən natural təsərrüfat aradan qalxır, bazar üçün istehsal olunan məhsullar artırdı. Buna görə də feodallar vergiləri məhsulla deyil, pulla almağa başladılar.

Feodalizm dövründə Şərq və Qərb kəndlilərinin ödədikləri vergilər o qədər də fərqlənmirdi. Onlar torpaq sahibləri ilə yanaşı, həm də dini idarələrə vergi verirdi. Bu vergi, adətən, kəndlinin əldə etdiyi məhsulun onda birini təşkil edirdi.

**S** **Kəndlinin feodal qarşısında hansı öhdəlikləri var idi?**

# Feodalizmin inkişaf mərhələləri

Kəndlilərin ağır istismara məruz qalmasına baxmayaraq, feodalizmin yaranması bəşər tarixinin inkişafında mühüm rol oynamışdır. Quldarlıq quruluşundan fərqli olaraq, dünya xalqlarının çoxu bu tarixi mərhələni keçmişdir. Feodalizmə keçid müxtəlif ölkələrdə ayrı-ayrı dövrlərdə baş vermişdir. Şərq ölkələrində bu quruluş daha tez yaranmış və Qərb ölkələrinə nisbətən daha gec dağılmışdır. Bəzi xalqlar (ərəblər, türklər, almanlar və monqollar) icma quruluşundan birbaşa feodalizmə keçmişdir. Bunun əsas səbəbi həmin xalqların qalibiyyətli müharibələr nəticəsində geniş ərazilərə malik dövlətlər qurması ilə bağlı idi.

### Feodalizm quruluşu (orta əsrlər) inkişaf səviyyəsinə görə 3 dövrə ayrılır:

**1. Erkən feodalizm dövrü**
Şərqdə III–XI, Avropada isə V–XI yüzillikləri əhatə edir.

**2. İnkişaf etmiş və ya klassik feodalizm dövrü** XI–XV yüzillikləri əhatə etmişdir.

**3. Son feodalizm dövrü**
Avropada XVI–XVII yüzilliklərdə, Şərqdə isə XVI–XIX yüzilliklərdə mövcud olmuşdur. Bu mərhələdə məhsuldar qüvvələrin inkişafı, satış üçün istehsal edilən malların artması, natural təsərrüfatın dağılması nəticəsində feodalizm yeni ictimai quruluşla əvəz edilməyə başladı. Bu dövr Şərqdə XIX yüzilliyə qədər davam etmişdir.



# XALQLARIN BÖYÜK KÖÇÜ. AVROPA HUN VƏ AĞ HUN DÖVLƏTLƏRİ

**Köç, Hunlar, Attila, Katalaun, Eftalitlər**

Böyük Hun dövləti dövründə türk xalqları daha geniş ərazilərdə yaşamağa başladı. Türklərin Asiyada yaşadıqları ərazilər, əsasən, sərt iqlimə malik çöllər idi.

Onların əsas məşğuliyyəti maldarlıq və ovçuluq idi. İqtisadi çətinliklər, quraqlıq, əhali sıxlığı və otlaqların çatışmaması köçlərə səbəb olurdu.

Türklər otlaqları bol olan yeni yurd tapmaq üçün bəzən iqtisadi baxımdan daha əlverişli ərazilərə köç edirdilər.

Siyasi və sosial hadisələr də türklərin yerdəyişməsinə təkan verirdi. Tarix boyu heç bir dövlətin əsarəti altında yaşamağı qəbul etməyən türklər dövlətlərini qurmaq üçün yeni ərazilərə köç etməyə ehtiyac duymuşlar.

Əhalinin sayının sürətlə artması da köçə səbəb olan amillərdən idi.

IV–VII yüzillikləri əhatə edən bu köçlər **"Xalqların böyük köçü"** adlanır. Hun adı ilə tanınan bu tayfalar qərbdəki məhsuldar torpaqlara doğru hərəkət edərək İdil (Volqa) çayını keçib geniş ərazilərə yayıldılar. Onların təzyiqi altında alanlar, qotlar və digər xalqlar da Mərkəzi və Qərbi Avropaya köçməyə məcbur oldu.

Hunların bir qolu Ön Asiya istiqamətinə, digər qolu isə Mərkəzi Asiyanın cənubuna doğru hərəkət etdi.



**Xalqların böyük köçünə səbəb olan amillər nələrdir?**

## Avropa Hun dövləti

Hunlar qərbə hərəkət edən zaman IV yüzilliyin 70-ci illərində Don və İdil çayları arasında alanlara məxsus əraziləri tutdular.

Sonra onlar Don çayını keçib Azovətrafı ərazini, Terek və Kubanı ələ keçirdilər. Sürətli yürüşlə Krıma tərəf hərəkət edən hunlar həmin ərazilərdə yaşayan qotlarla üzləşdilər. Qotları

*Katalaun döyüşü*





məğlub edən hunlar Balamir xanın rəhbərliyi altında Avropa Hun dövlətini yaratdılar.

Qərbə doğru irəliləyən hunlar indiki Macarıstan ərazisində məskunlaşdılar. Beləliklə, Cənub-Şərqi Avropanın İdil çayından Dunay çayına qədər ərazisi hunların nəzarətinə keçdi.

Avropa Hun dövlətinin qüdrəti Attilanın hakimiyyəti illərində daha da artdı. Dövlətin sərhədləri şərqdə İdil (Volqa) çayından qərbdə Reyn çayına, cənubda Balkan yarımadasından şimalda Baltik dənizi sahillərinə qədər geniş bir ərazini əhatə edirdi.







**Xalqların böyük köçünün əhəmiyyəti nə oldu?**

Attila 434-cü ildə Bizansla (Şərqi Roma) bağladığı müqavilə ilə ticarət əlaqələrini tənzimləmiş, Bizansı illik xərac ödəməyə məcbur etmişdi. Bununla da qərbdəki hakimiyyətini möhkəmləndirməyə nail olmuşdu.

Hun imperiyası Bizans və başqa Şərq ölkələri ilə aktiv ticarət edirdi. Lakin Bizans hər vasitə ilə hunları zəiflətməyə, hədiyyələr verməklə onlara tabe olan xalqları ayağa qaldırmağa çalışırdı.

Attila bunlara dözməyərək Konstantinopolun qala divarlarına qədər getdi. Qorxuya düşən Bizans imperatoru 447-ci ildə tez Attila ilə danışıqlara başladı və böyük məbləğdə illik bac verməyə razılaşdı.



**Bizans nə üçün hunları zəiflətmək istəyirdi?**

# Katalaun döyüşü

Bizansı bac verməyə məcbur edən Attila Qərbi Roma imperiyası üzərinə yürüşə başladı, Qalliyaya (indiki Fransaya) hərbi səfər təşkil etdi. Hunlar Burqundiyanı işğal edib Orlean şəhərinə çatdılar.

451-ci ildə Katalaun çölündə Qərbi Roma ilə Attilanın orduları qarşılaşdı. Roma ordusunda hunlar tərəfindən dəfələrlə məğlub edilmiş qotlar, franklar və Şərqi Avropa xalqlarından muzdla tutulmuş çoxlu döyüşçü iştirak edirdi.

Qanlı döyüşdə hər iki tərəfdən minlərlə döyüşçü həlak oldu. Gecə Roma ordusu geri çəkildi. Attila Roma ordusundakı döyüşçülər arasında yayılmış xəstəliyin əsgərlərinə keçməsindən ehtiyat edərək onları təqib etmədi və yeni səfərə hazırlaşdı.

Attila 452-ci ildə Romanın şəhər və kəndlərini ələ

keçirərək xeyli qənimət əldə etdi. O, Romaya sığınmış qotları Katalaun döyüşündə düşmən tərəfində döyüşdüklərinə görə cəzalandırdı. Hunlar Roma şəhərinə qədər irəlilədilər. Attila Roma papasının (Qərbi Avropada xristianların dini başçısı) xahişi ilə şəhəri tutmaq fikrindən daşındı. Beləliklə, hunlar Qərbi Roma üzərində üstünlük əldə etdilər.

Roma səfərindən qayıtdıqdan sonra sasanilər üzərinə yürüşə hazırlaşan Attila müəmmalı şəkildə öldü. Hun dövlətinə tabe edilmiş xalqlar baş qaldırdı. Qotlar hunlara qarşı üsyan etdilər. Attiladan sonra hakimiyyətə gələn varisləri dövlətin qüdrətini qoruyub saxlaya bilmədilər. Hunlar Qara dənizin şimalına doğru geri çəkildilər. 470-ci ildə Avropanı lərzəyə salan Avropa Hun dövləti süquta uğradı.



Avropa mənbələrində olan məlumatlara görə, Attila möhkəm iradəyə və dərin ağla malik idi. O, adamları asanlıqla təsiri altına ala bilir, tabeçiliyində olanların xəyanətlərini bağışlamır, sərt cəzalandırırdı. Buna görə də orduda möhkəm nizam-intizam mövcud idi. Qaynaqların yazdığına görə, Attila orta boylu, enlikürək, qara saçlı, seyrək saqqallı idi. Onun ensiz gözlərinin iti baxışları adamı vahiməyə salırmış. Attila həm də alicənab və xeyirxah idi. Avropa əhalisi ona "Tanrı qırmancı Attila" adı vermişdi.



Katalaun döyüşündə Roma ordusunun başında Aetsi adlı cavan, hərbi məharətli sərkərdə dururdu. Atası alman (qot), anası romalı olan Aetsi uşaqlıqda hunlara əsir düşmüş və Attilanın uşaqlıq dostu olmuşdu. Hər ikisi at çapmaq və ox atmaqda mahir idi. Bu bacarığına görə Attila Aetsinin xətirini çox istəyir və onunla dostluq edirdi.
Aetsi əsirlikdən azad edildikdən sonra Roma ordusunun başçısı təyin edilmişdi. Onun hun dilini yaxşı bilməsi, hunların döyüş taktikası ilə yaxından tanışlığı və şəxsi hərbi bacarığı bu vəzifəyə təyin olunmasında mühüm rol oynamışdı.






**Attilanın qüdrətli hökmdar olduğunu təsdiq edən hansı faktları sadalaya bilərsiniz?**



**Katalaun döyüşünün baş verdiyi ərazini müasir xəritədə tapın.**

# Ağ Hun dövləti

Böyük Hun dövlətinin dağılmasından sonra hunların böyük hissəsi İdil çayından qərbə doğru hərəkət etsə də, onların bir qismi Qərbi Türküstana köçdü. Sasani dövləti ilə mübarizə aparan hunlar IV yüzilliyin ikinci yarısında Ağ Hun dövlətinin əsasını qoydular.

Bu dövlət V yüzillikdə hakimiyyətdə olmuş Eftal xanın adı ilə həm də Eftalitlər dövləti kimi də tanınırdı. Ağ Hun dövlətinə Mərkəzi Asiya, Əfqanıstan və Şimal-Qərbi Hindistanın bir hissəsi daxil idi. Dövlətin sərhədləri Monqolustanın qərbindən Xəzər dənizinə qədər çatırdı. Ağ hunlar Ağsuvar xanın dövründə fəal xarici siyasət yürüdür və qonşu əraziləri ələ keçirirdilər. Onlar V yüzilliyin ortalarında sasanilərə qarşı qalibiyyətli müharibələr apararaq İran yaylasının şərq hissələrinə və Türküstana hakim oldular. Ağ hunlar 484-cü ildə sasanilər üzərində növbəti qələbədən sonra Heratı tabe etdilər.

Ağ Hun imperiyasının ən qüdrətli dövrü VI yüzillikdə hakimiyyətdə olmuş Mihiraqul xanın adı ilə bağlıdır. Onun dövründə yaxşı təlim görmüş və nizami orduya sahib olan hunlar fasiləsiz yürüşlər edərək Hindistanın şimal-qərbinin işğalını başa çatdırdılar. İmperiyanın ərazilərinin genişlənməsi ilə idarəetmədə də çətinliklər yaranır, tabe olan ərazilərdə etirazlar başlanırdı. Beləliklə, feodal əyanlarının müstəqillik arzuları gücləndi. Bu dövrdə yenicə yaranmış Göytürk dövləti ağ hunlara qarşı hərbi müdaxiləyə başladı.

567-ci ildə Sasani və göytürklərin birləşmiş qüvvələri Ağ Hun dövlətinə son qoydu. Onun torpaqları iki dövlət arasında bölüşdürüldü.



**Sizcə, Ağ Hun dövlətinin arazisinin genişlənməsi ilə niyə idarəetmədə çətinliklər yarandı?**

**Hun dövlətləri**

T **Avropa Hun dövləti ilə Ağ Hun dövlətini müqayisə edin.**

Slavyanlar
AVROPA HUN İMPERİYASI
QƏRBİ ROMA İMPERİYASI
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ
BİZANS İMPERİYASI
ARALIQ DƏNİZİ
SASANİ DÖVLƏTİ
AĞ HUN İMPERİYASI
İRAN KÖRFƏZİ
QIRMIZI DƏNİZ



# GÖYTÜRK VƏ UYĞUR XAQANLIQLARI

**Aşina nəsli, Bumın, Çinlə mübarizə, Kür Şad, İltəris**

Asiya Hun (Böyük Hun) dövlətinin dağılmasından sonra Altay dağlarının ətəklərində yerləşən hunların bir qismi burada dövlət yaradan avarlara (jujanlara) sığınmışdı. Onlar dəmirçiliklə məşğul olur, avarlar üçün silah düzəldirdi. Avarların tərkibində olmasına baxmayaraq, hunlar digər türk tayfaları ilə qaynayıb-qarışaraq çoxalırdılar. Bu tayfalar daha çox ***göytürk*** adı ilə xatırlanır. Onların başçısı isə ***Aşina nəslindən*** olan Bumın xaqan idi. Avarların zülmünə qarşı mübarizə aparan göytürklər onları ağır məğlubiyyətə uğratmış və 552-ci ildə yeni bir türk dövlətinin – ***I Göytürk xaqanlığının*** əsasını qoymuşdular. Dövlətin paytaxtı ***Ötükən*** şəhəri idi.



**Göytürk dövləti hansı şəraitdə yarandı?**



***Bumın xaqanın heykəli***

Göytürklər türk adını ilk dəfə rəsmi dövlət adı olaraq qəbul etmişdilər.

Türk dövlətlərinin əraziləri çox böyük olduğundan idarəçilik çətin idi. Buna görə də dövlətlər şərti olaraq iki hissəyə ayrılırdı. Əsas hissəyə xaqan, digər hissəyə isə xaqan nəslindən olan məşhur sərkərdələr başçılıq edirdi.

Muğan xaqanın hakimiyyəti dövründə ***yabqu (xaqandan sonra ikinci şəxs)*** olan İstəmi xan dövlətin Qərb vilayətlərini idarə edirdi. Ağıllı, igid və tədbirli bir hökmdar olan Muğan xaqanın tədbirləri nəticəsində Göytürk dövləti özünün qüdrətli çağını yaşamışdır. O, dövləti gücləndirərək ərazisini genişləndirmə siyasəti yürüdürdü. Muğan xaqan avarlara



qarşı aparılan mübarizəni davam etdirmiş və onları qovmağa nail olmuşdu. O, qonşu dövlətləri, xüsusilə Çini asılı hala salmışdı.

İstəmi xan xəzərləri tabe etdikdən sonra Bizans üzərinə uğurlu hücum etsə də, diplomatik münasibətlərə üstünlük verdi.

Əsas səbəb sasanilərin ortaq düşmən olması idi. Sasanilər onların mühüm ticarət yollarından istifadə etməsini məhdudlaşdırmışdılar. Sasanilərlə birlikdə Ağ Hun dövlətinə son qoyduqdan sonra keçmiş müttəfiqlər arasında narazılıq yarandı.

İstəmi xan sasanilərin ağ hunlara ödədikləri verginin indi göytürklərə verilməsini tələb etdi. Bu tələb onlar arasında müharibəyə səbəb oldu. Müharibə nəticəsində üstünlük qazanan göytürklər ***Soqdiana*** vilayətinə sahib oldular.

***Göytürklər döyüşdə***

Muğan və İstəminin vəfatından sonra Göytürk dövlətində varislər arasında hakimiyyət uğrunda mübarizə başladı.

Anaları çinli olan şahzadələrin Çinlə yaxınlaşma cəhdləri və türk inanclarına yad olan buddizmi yaymaq istəkləri dövlət daxilindəki ziddiyyətləri daha da artırdı. Nəticədə ***VI yüzilliyin 80-ci illərində*** dövlət iki hissəyə – Şərqi və Qərbi Göytürk dövlətlərinə parçalandı. Dövlətin parçalanması onun iqtisadi və hərbi qüdrətini zəiflətdi. Bu vəziyyətdən istifadə edən düşmən dövlətlər, xüsusilə Çin mövqeyini möhkəmlətməyə nail oldu. Çinlilər ***VII yüzilliyin 30-cu illərində Şərqi Göytürk, 50-ci illərində isə Qərbi Göytürk dövlətini asılı hala saldılar.***



**I Göytürk dövlətinin parçalanma səbəbləri hansılardır?**

# İkinci Göytürk xaqanlığı

Əsarət altında qalmaqla barışmayan türklər tez-tez üsyanlar edir, azad olmaq uğrunda canlarını fəda etməkdən belə çəkinmirdilər. Belə üsyanlardan biri 639-cu ildə təcrübəsindən istifadə etmək üçün çinlilərin öz ordularına daxil etdikləri türk sərkərdəsi Kür Şadın başçılığı ilə oldu. Üsyanda iştirak edən 40 nəfər qəhrəmancasına vuruşsa da, məğlub oldu.

VII yüzilliyin 80-ci illərində azadlıq mübarizəsi həlledici mərhələyə daxil oldu. Bu mübarizəyə başçılıq edən Qutluq xan qalib gəldi. Beləliklə, 682-ci ildə Çin əsarətinə son qoyularaq müstəqillikləri bərpa edildi və **II Göytürk dövləti yaradıldı.** Qutluq xan İltəris xaqan adı ilə dövlətin ilk hökmdarı oldu. Ötükən şəhəri isə yenidən paytaxt oldu.

İltəris xaqan özündən əvvəlki xaqanlardan fərqli olaraq, çinli qızla deyil, türk qızı ilə evləndi. Bununla da çinlilərin türk idarəçiliyinə müdaxiləsinin qarşısı alındı.

Göytürklərin müstəqilliyinin bərpa edilməsində və möhkəmlənməsində həm cəsur sərkərdə, həm də alim olan Tonyukukun da böyük xidmətləri olmuşdur. Sonradan İltərisin yaxın köməkçisi təyin edilən Tonyukuk ordunun və diplomatik işlərin təşkilində səlahiyyətli şəxs oldu.

İltəris xaqanın vəfatından sonra oğlanları Kül tigin və Bilgə azyaşlı olduğundan hakimiyyətə qardaşı Qapağan xaqan gəldi. Onlar Qapağan xaqanla birlikdə dövlətin qorunub saxlanılmasında yaxından iştirak edib idarəçilik təcrübəsi qazandılar. Bu amil əmilərindən sonra hakimiyyətə gəlməkdə onlara kömək etdi.

VIII yüzilliyin əvvəllərində xaqanlıq taxtına oturan Bilgənin hakimiyyət illəri II Göytürk



**Göytürk dövlətinin inkişafetmə səbəblərini araşdırın.**



Qərb tarixçilərinin "Türklərin Bismarkı" adlandırdığı Tonyukuk böyük sərkərdə və uzaqgörən şəxsiyyət idi. O, Göytürk dövlətində ordunu və idarə sistemini nizamlamışdı.

Bilgə xaqanın zamanında onun tövsiyələri, nəsihətləri dövlətin möhkəmlənməsində böyük rol oynamışdır. Bilgə xaqan çinlilər kimi böyük şəhərlərin ətrafına hasarlar çəkdirmək istəyəndə Tonyukuk buna imkan verməmiş və demişdi: "Bizim ən böyük üstünlüyümüz köçəriliyimizdə, sərbəst hərəkətimizdədir. Çünki hər fürsətdə hücum etməyə və uğursuz vəziyyətlərdə düşmənin təqibindən asanlıqla yayınmağımıza imkan verir".

Bilgə xaqan Çin tipli paytaxt və buddist məbədlər tikdirmək istəmiş, lakin Tonyukuk bunun da böyük səhv olduğunu göstərmişdi.



**Tonyukukun dövlətin siyasi həyatındakı rolu barədə müzakirə aparın.**

*Türk obası*



***Göytürklərə aid qaya üzərində oyulmuş şəkil***

***Kül tigin***



dövlətinin ən yüksək inkişaf dövrü hesab edilir.

Dövlətin möhkəmləndirilməsində Bilgə xaqanın yaxın köməkçiləri: qardaşı Kül tiginin və məsləhətçi Tonyukukun böyük rolu olmuşdur.

Onun dövründə Mərkəzi Asiyada olan digər türk tayfaları da Göytürk dövlətinə tabe edildi. Bilgə xaqan göytürklərə qarşı düşmənçilik siyasəti yeridən Çin üzərinə uğurlu yürüşlər etdi.

Ancaq əvvəlcə Tonyukuk və Kül tiginin, sonra isə Bilgə xaqanın ölümü VIII yüzilliyin 30-cu illərində II Göytürk dövlətinin zəifləməsinə səbəb oldu.

Şahzadələr arasında hakimiyyət uğrunda aparılan mübarizələr vəziyyəti daha da ağırlaşdırdı. Tabe edilmiş digər türk tayfaları, xüsusilə də uyğurlar yaranmış şəraitdən istifadə edərək ***744-cü ildə*** hakimiyyəti ələ keçirdilər.




**Bilgə xaqanın hakimiyyəti dövründə dövlətin inkişaf səbəblərini araşdırın.**

***Orxon çayı***

# Uyğur xaqanlığı

Uyğurlar Mərkəzi Asiyada yaşayan türk tayfalarından idi. Onlar haqqında ilk məlumatlar II yüzilliyə aiddir. Bir müddət göytürklərdən asılı olan uyğurlar onların zəifləməsindən istifadə etdilər.

Göytürklərin hakimiyyətinə son qoyan uyğurlar öz dövlətlərini yaratdılar. Paytaxtı **Ordu** şəhəri olan **Uyğur** dövlətinin qurucusu **Qutluq Bilgə Kül** xaqan idi. Qutluq Bilgə Kül xaqanın vəfatından sonra hakimiyyətə oğlu Moyon Çur xaqan gəldi. Onun hakimiyyətə gəlişi əvvəlcə narazılıqla qarşılansa da, o, hakimiyyətini möhkəmləndirə bildi.

Talas vadisində ərəblərlə çinlilər arasında baş verən döyüşdə çinlilər məğlub olub Mərkəzi Asiyadan geri çəkilməli oldular.

Həmin torpaqlara ərəblər deyil, Moyon Çurun başçılığı ilə uyğurlar sahib oldu.

Talas məğlubiyyəti uyğurlara Çinin daxili işlərinə müdaxilə etməyə də şərait yaratdı. Belə ki anası türk olan Çin sərkərdəsi imperatoru devirib hakimiyyətə sahib oldu. İmperator hakimiyyətini bərpa etmək üçün uyğurlardan kömək istədi. Moyon

Çur Çinə yürüş edib imperatorun hakimiyyətini bərpa etdi. Çinlilər isə əvəzində uyğurlara ipəklə xərac ödəməli oldular.



**Talas döyüşünün uyğurlar üçün hansı əhəmiyyəti olmuşdur?**

Moyon Çur xaqandan sonra hakimiyyətə Bögü xaqan keçdi. Onun dövründə uyğurlar Çin üzərində nüfuzlarını daha da artıraraq ölkənin ticarət əlaqələrini nəzarətə götürdülər.

Tibetlilərin Çinə hücumu zamanı isə onların qarşısına uyğurlar çıxdı. Tibetlilərin Çini ələ keçirməsi uyğurların buradakı üstünlüyünə, o cümlədən gəlirlərinə zərbə vura bilərdi. Buna görə də Bögü xaqan onları məğlub edib Çindən qovdu.

Bögü xaqanın dövründə hökmdar və onun ətrafı Maniçiliyi* qəbul etdi. Maniçilik, əsasən, müharibə etməməyi təbliğ edirdi. Bu da uyğur türklərinin döyüş ruhunu aşağı saldığı üçün əhali arasında qəbul olunmurdu. Nəticədə Uyğur dövlətində dini parakəndəlik baş verdi.

IX yüzilliyin əvvəllərində xaqanların sui-qəsd nəticəsində öldürülməsi, dini parakəndəlik Uyğur dövlətini zəiflətdi. Yaranmış şəraitdən tabe edilmiş tayfalar, o cümlədən qırğızlar istifadə edərək **IX yüzilliyin 40-cı illərində** Uyğur dövlətinin varlığına son qoydular.

Uyğurlar yüksək şəhər mədəniyyətinə malik xalq olmuşdur. Onlar yeni şəhərlər salır, dağılmış şəhərləri isə bərpa edirdilər.

*** Maniçilik**

*Əsası Mani tərəfindən qoyulmuş dini təlim*

Uyğur dövlətinin İpək yolu üzərində yerləşməsi şəhərlərin inkişafına, ticarət əlaqələrinin genişlənməsinə şərait yaratmışdır.

Avropalılardan əvvəl kağız istehsal edən uyğurlar mətbəə yaratmışdılar. Maniçiliyin yayılması üçün lazım olan kitablar mətbəədə çap olunurdu.

Uyğurlar kitab çapını çinlilərdən öyrənmişdilər. Ərəblər isə bunu uyğurlardan mənimsəmiş və Avropaya yaymışdılar.



**Göytürk və Uyğur dövlətlərinin zəifləməsi və süqutunun səbəblərini müqayisə edin.**



**Uyğur mədəniyyətinin dünya sivilizasiyasının tərkib hissəsi olmasını əsaslandırın.**



# AVAR, XƏZƏR VƏ BULQAR DÖVLƏTLƏRİ

**Bayan xaqan, Konstantinopolun mühasirəsi, franklarla mübarizə, Xəzər asayişi, Qurd xan**

Şərqi Hun dövlətinin süqutundan sonra 394-cü ildə türk tayfaları Şərqi Türküstanda Ay xaqanın başçılığı altında Asiya Avar dövlətini qurdular. Avar xaqanlarının monqol əyanlarını da dövlət işlərinə cəlb etmələri onların türklər arasında nüfuzlarını azaltdı. Nəticədə hakimiyyət 552-ci ildə göytürklərin əlinə keçdi. Göytürklərlə mübarizədə məğlub olan avarlar qərbə doğru köçməyə məcbur oldular.

Sabirlər və digər qohum türk xalqları ilə birləşən avarlar Qafqazın xeyli hissəsini, həmçinin Qara dənizin şimal sahillərini tutdular. Onlar VI əsrin ikinci yarısında Bayan xaqanın başçılığı altında Avropa Avar dövləti qurdular. Bizansın şərq və şimal torpaqlarına hücum edən avarlar Dunay ətrafına yerləşdirilmiş slavyanları özlərinə tabe edərək Mərkəzi Avropada xeyli ərazilər ələ keçirdilər. Daha sonra Elba çayı sahilindəki döyüşdə frankları darmadağın edən avarlar onların kralını əsir tutdular.



*Bayan xaqan*



*Avar süvarisi*



**Avarların uğurlarının səbəbləri nə idi?**

Avarlar Konstantinopolu mühasirəyə alsalar da, hərbi gəmiləri olmadığına görə şəhəri tuta bilmədilər. Bu, türklər tərəfindən Konstantinopolun ələ keçirilməsi məqsədilə edilən ilk mühasirə hesab edilir.



Avarların Konstantinopolu tuta bilməməsi nəticəsində bəzi türk xalqları xaqanlıqdan ayrıldı.



**Konstantinopolun ələ keçirilə bilməməsinin Avar dövlətinə hansı təsiri oldu?**

788-ci ildə Avar xaqanlığının orduları İtaliyanın şimalını tutdu. Bu hadisə Frank krallığı ilə avarlar arasında müharibəyə səbəb oldu.

Slavyanlar bu müharibədə frankların tərəfinə keçdilər. Nəticədə Mərkəzi Avropanın xeyli hissəsi Avar xaqanlığının tərkibindən çıxdı. Bu ərazilərə alman tayfalarının köçürülməsi başlandı. Onların avarlar arasında xristianlığı yaymaları nəticəsində avarlar get-gedə almanlaşmağa başladılar.



*Avarların Konstantinopola hücumu*



*Avar döyüşçüsü*

*Avarların Konstantinopolu mühasirəyə alması*

IX yüzilliyin əvvəllərində Frank imperatoru Böyük Karl Avar dövlətinin  paytaxtını işğal etdi. Bundan sonra avarlar  yalnız indiki Macarıstanın şərqində, Rumıniyanın və Bolqarıstanın şimalındakı əraziləri əllərində saxlaya bildilər. Buradakı avarlar Asiyadan köçüb gəlmiş tayfalarla birlikdə Macarıstan krallığını qurdular.

Avar xaqanlığı indiki slavyanların, almanların, macarların və rumınların mədəni həyatında mühüm rol oynamışdır.

Avropalı tarixçilərin yazdığına görə, “Meşələrdə həyat sürməyə öyrəşmiş slavyanlar avarlardan dövlət qurmağı və döyüşməyi öyrəndilər”.





Qərb slavyanlarının avarlarla bağlı çoxlu rəvayətləri vardır.

Onlardan birində deyilir: "Avarların boyları o qədər uca idi ki, ən hündür ağaclar onların dizlərinə çatırdı. Avar döyüşçüsü çəkməsinə yapışan palçığı təmizlədikdə təpə yaranırdı". İndi də çex, slovak və polyak dillərində avar sözü "nəhəng", "qüdrətli" mənasında işlənir.




**Slavyanların avarlarla bağlı bu təsəvvürləri nədən irəli gəlirdi?**




**Avropada yeni bir türk dövlətinin yaranmasının əhəmiyyətini izah edin.**




**Avarların Avropa xalqlarının mədəni həyatındakı rolunu araşdırın.**

# Xəzər dövləti

Qərbi Göytürk dövlətinin varisi olan Xəzər dövlətinin qurulmasında xəzər, barsil, sabir və digər türk tayfaları iştirak etmişdir. Bu tayfalar hələ Xalqların böyük köçündən əvvəl Qafqazda və ona qonşu ərazilərdə yaşayırdılar.

Xəzər dövlətinin paytaxtları Bələncər, Səməndər, daha sonra isə İdil şəhərləri olmuşdur. Xəzərlər sasanilərin Azərbaycanda, eləcə də Cənubi Qafqazda möhkəmlənməsinə imkan vermədilər. Xəzər xaqanlığı Şərqi Avropa tarixində böyük rol oynadı. Bu, dövlət adları çəkildikdə belə qonşu xalqları lərzəyə salan ərəb sərkərdələrinin şimala doğru hücumlarının qarşısını aldı.

Xəzər dövlətinin başında Göytürk xaqanlarının nəslindən olan xaqan dururdu.

Qədim türk adətinə görə xaqan olacaq adamın boynuna bir neçə yerdən kəmənd atıldıqdan sonra onu sıxmağa başlayır və neçə il hökmranlıq edə biləcəyini soruşurdular. Əgər xaqan bu mərasim zamanı söylədiyi vaxtdan çox hakimiyyətdə qalmaq fikrinə düşərdisə, onu hakimiyyətdən uzaqlaşdırırdılar.



**Türk xalqlarında təsadüf olunan bu adətə münasibət bildirin.**



198-ci ildə xəzərlərin və barsillərin birləşmiş qüvvələri Çola (Dərbənd) qapılarını, sonra isə Kür çayını keçib onun sol sahillərinə səpələndi.

Qərbdə Ərdahan, şərqdə Gəncə, şimalda Tiflis, cənubda İrəvan ilə əhatəli yerlərdə qarapapaq adı ilə tanınan barsillər II–III yüzilliklərdəki böyük yürüşlər nəticəsində buralara yerləşmiş və buraya öz adlarını – Borçalı adını vermişlər.



VIII–IX yüzilliklər Şərqi Avropa tarixində "Xəzər asayişi" dövrü adlanır. Bu dövrdə sıx meşələrdə yaşayan slavyan qəbilələri Xəzər xaqanının icazəsi ilə Desna və Dnepr çayları arasındakı ərazilərə yerləşdilər. Cənubda ərəb orduları ilə uzun sürən müharibələr aparan xəzərlər şimala doğru çəkildilər. Buradakı meşələrdə yaşayan şərqi slavyan tayfaları xəzərlərə tabe olaraq vergi ödəməyə razılıq verdilər.



**"Xəzər asayişi" dövrü nə deməkdir?**



Dövlətdə ikinci nüfuzlu şəxs xaqanbəyi hesab olunurdu. O, xaqan qarşısında sədaqət andı içib vəzifəsini yerinə yetirməyə başlamamış odun üstündən keçməli idi.

Xaqanlığın dövlət dili türk-xəzər dili idi. Xəzərlər qalıqları dövrümüzə qədər gəlib çatmış böyük şəhərlər salmışdılar. Şəhərlərin əsas əhalisini mərkəzdə yaşayan türklər təşkil edirdi. Hər bir şəhərdə müsəlman, xristian, yəhudi və tanrıçılığı təmsil edən üzvlərdən ibarət dövlət məhkəməsi fəaliyyət göstərirdi.

Dövlətin iqtisadiyyatının əsasını əkinçilik, maldarlıq, sənətkarlıq təşkil edirdi. Xəzərlər ticarətdən əldə etdikləri gəlir, ərazilərindən keçən karvan yollarından



***Xəzər döyüşçüləri***

alınan gömrük, habelə tabe edilmiş xalqların ödədikləri vergilər hesabına güclü ordu qurmuşdular.

Ərəblərlə aparılan uzun sürən müharibələr, qonşu türk xalqı olan peçeneqlərin hücumları, habelə dövlətin ərazisində müxtəlif dinlərin yayılması Xəzər xaqanlığının zəifləməsinə gətirib çıxardı.

Bundan istifadə edən Kiyev knyazlığı X yüzilliyin 60-cı illərində xaqanlığın şəhərlərini talayaraq çoxlu qənimət ələ keçirdi. Nəticədə Xəzər xaqanlığı süqut etdi.

Xəzərlərin adı XII yüzilliyə qədər bəzi mənbələrdə çəkilsə də, onlar artıq öz əvvəlki qüdrətlərini itirmişdilər.




**Xəzərləri Şərqi Avropanın və Cənubi Qafqazın müdafiəçiləri adlandırmaq olarmı?**

***Kiyev knyazının Xəzərin paytaxtı İdil şəhərinə hücum etməsi***

# Böyük Bulqar dövləti

Bulqarlar erkən orta əsrlərdə çox geniş bir ərazilərdə – Volqaboyunda, Qafqazda, Ön Asiyada və Şərqi Avropada məskunlaşmışdılar. Attilanın ölümündən sonra hunların bir hissəsi Azov və Xəzər dənizləri arasında daha əvvəllər yaşayan bulqarlarla qarışdı.

Bir müddət Avar xaqanlığı tərkibində olan bulqarlar 630-cu ildə Qurd xanın başçılığı altında Böyük Bulqar dövlətini qurdular. Az sonra bu dövlətin qonşuluğunda Göytürk xaqanlığının varisi olan Xəzər dövləti yarandı.

Qurd xanın ölümündən sonra Azov dənizi ilə Xəzər dənizi arasındakı ərazilərdə yaşamağa davam edən bulqarlar Xəzər xaqanlığına tabe oldu. Onlara "qara bulqarlar" deyilirdi.

Bulqarların bir hissəsi Qurd xanın oğlu Qotraq xanın başçılığı altında şimala doğru gedərək Volqa, Don, Kama sahillərində müstəqil dövlət yaratdı. Onun tərkibində 7 türk eli birləşdiyindən Volqa çayı və onun ətrafına Yeddi el (İdil) deyilirdi. Bu dövlətin əhalisi "ağ bulqarlar" adlanırdı.

Qurd xanın digər oğlu Asparux ("Esperi" qədim türk dilində "şahin" deməkdir) xan isə ona tabe olan bulqarlarla Dunay sahillərinə doğru hərəkət etdi.



**Bulqarların həyatında baş vermiş hadisələrin xronoloji çərçivəsini müəyyən edin.**



**Bulqarların yayıldığı əraziləri xəritədə göstərin.**

# İdil (Volqa) Bulqar dövləti

Qotraq xan Orta Volqaboyunda yaşayan qohum tayfalarla birlikdə müstəqil Türk dövlətinin əsasını qoydu. Dövlətin paytaxtı əvvəlcə Bulqar, sonra isə Bilər (Bilyar) şəhərləri oldu. 922-ci ildə Qotraq xanın varisi İslam dinini qəbul etdi.

Yaratdıqları güclü ordu hesabına bulqarlar dəfələrlə ölkələrinə soxulmuş slavyanların hücumlarını qətiyyətlə dəf edərək geri oturtmuşdular.



*Bulqar süvarisi*

*Qotraq xan İdil (Volqa) çayı sahilində*



# Dunay Bulqar dövləti

679-cu ildə Dunay sahillərinə gələn Asparux xan Bizans ordusunu darmadağın etdi. Bölgədə məskunlaşmış slavyan tayfaları Asparux xanın hakimiyyətini qəbul etdi. Bizans imperatorları bulqarlara xərac verməyə məcbur oldu. Asparux xan azsaylı bulqarların çoxsaylı slavyanlarla qarışmasının qarşısını almaq məqsədilə onların slavyanlarla nikaha girmələrini qadağan etdi.

IX yüzilliyin əvvəllərində Konstantinopol ikinci dəfə türklər tərəfindən mühasirəyə alındı. Bulqar xanını Bizans casusu zəhərlədiyi üçün bu mühasirə uğursuzluqla nəticələndi.

IX əsrin 60-cı illərində xristianlıq Dunay Bulqarıstanının rəsmi dövlət dini elan edildi. Lakin türk-bulqar əyanları buna qarşı çıxaraq tanrıçılıq dinini qorumağa çalışırdılar.





**Bulqarların Konstantinopolu ələ keçirə bilməməsinin səbəbi nə idi?**

Sonralar Dunay Bulqarıstanında olmuş xristian rahiblər bulqar türkləri içərisində hələ də tanrıçılıq dininin və Boz Qurd inancının qalmasını xüsusi qeyd edirdilər.





**Bulqarların qurduğu dövlətlərin süqut etmə səbəblərini nədə görürsünüz?**

*Asparux xan Dunay çayı sahilində*



Bulqar dövlətləri

İDİL BULQAR DÖVLƏTİ
Bilyar
Bulqar
BÖYÜK BULQAR DÖVLƏTİ
Fanaqoriya
DUNAY BULQAR DÖVLƏTİ
Pliska
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ
BİZANS
ARALIQ DƏNİZİ



# SASANİ DÖVLƏTİ. QAFQAZ



**Ərdəşir, Zərdüştülik, Manilik, Məzdək, I Xosrov**

Parfiya dövləti III yüzilliyin əvvəllərində daxili çəkişmələr və hakimiyyət uğrunda mübarizə nəticəsində zəifləmişdi. Əyalətlərin hakimləri mərkəzi hakimiyyətə tabe olmaq istəmirdilər. Belə bir şəraitdə əhali içərisində atəşpərəst kahinlərin nüfuzu artırdı. Belə kahinlərdən biri də Sasan idi. Onun nəvəsi Ərdəşir sonuncu Parfiya hökmdarı üzərində qələbə qazanaraq özünü şahənşah, yəni "şahlar şahı" elan etdi. Sülalənin əsasını qoymuş Sasanın adı ilə adlandırılan dövlətin paytaxtı vaxtilə selevkilər tərəfindən salınmış Ktesifon oldu. Parfiyanın da paytaxtı olmuş bu şəhər Şərqdə Mədain adı ilə tanınır.

Ərdəşir hakimiyyətə gəldikdən az sonra Azərbaycanın cənubunu (Atropatena) ələ keçirib, Roma ilə müharibələrə başladı. Mesopotamiya və Qafqazda sasanilərlə Roma arasında illərlə davam etmiş müharibələr başladı.

Romalıları bir neçə dəfə məğlubiyyətə uğradan Sasani şahı I Şapur geniş ərazilər ələ keçirdi. Sasanilərin sərhədləri Suriyadan Hind çayına, Böyük Qafqaz dağlarından Ərəbistan yarımadasına qədər böyüdü.



**Sasanilərlə Roma arasındakı müharibələrdən ən çox hansı ərazilər zərər çəkirdi?**

Sasanilərin şərq istiqamətindəki təcavüzkar yürüşlərini ağ hunlar dayandırdı. Onlar 457-ci ildə Mərkəzi Asiyanın bir hissəsini sasanilərin əlindən aldılar. Həlledici döyüş 484-cü ildə baş verdi. Sasani ordusunu darmadağın edən türklər şahın ailəsini, xəzinəsini və xeyli əsir ələ keçirdilər. Sasani şahı Firuz döyüşdə öldürüldü. VI yüzilliyin 60-cı illərinə qədər sasanilər ağ hunlara vergi verməyə məcbur oldular.

## Sasani dövləti və Qafqaz

Sasanilər və Romanın uğrunda mübarizə apardıqları əsas bölgələrdən biri də Qafqaz idi. Hər iki dövlət bölgədə möhkəmlənmək məqsədilə



*Sasanilərin gerbi*

*Sasanilərlə romalılar arasında döyüş*





öz dövlət dinlərini yaymağa çalışırdı. Qafqazın cənubunda hakimiyyətdə qalan Parfiya arşakiləri Ön Asiyanın və Mesopotamiyanın bir hissəsini onların əlindən qoparmış sasanilərin deyil, Romanın dövlət dinini qəbul etdilər. Sasanilərin Qafqaz əhalisinə zərdüşt dinini qəbul etdirmək cəhdi uğursuzluqla nəticələndi.

Qafqazda yerli əhalinin çoxunun tanrıçılıq dininə inanan türklərdən ibarət olması da sasanilərin burada möhkəmlənməsinin qarşısını aldı.

Türklər tərəfindən dəfələrlə məğlub edilən sasanilər onlara qarşı mübarizə aparmaq üçün Xəzər dənizi sahillərində istehkamlar və qalalar tikmiş, bu ərazilərə soydaşlarını köçürmüşdülər. Türklərə qarşı mübarizədə sasanilər hətta qatı düşmənləri olan Bizans imperatorluğu ilə ittifaq bağlamışdılar.

VII yüzilliyin əvvəllərində Bizansa qarşı başladığı müharibədə sasanilər xeyli uğur qazandılar. Lakin türklərin Bizans tərəfindən savaşa girməsi müharibənin gedişini tamamilə dəyişdi. Sasanilər ağır məğlubiyyətə uğradı. Bizansla sülh bağladıqdan sonra türkləri Qafqazdan çıxarmaq istəyən sasanilər 630-cu ildə Göyçə gölü sahillərində türklər tərəfindən darmadağın edildi.




**"Cənubi Qafqazın işğalçılardan qorunmasında türk tayfalarının rolu" mövzusunda müzakirə keçirin.**



Selevkilər və Parfiya dövründə özünüidarə hüququna malik olan şəhərlər sasanilərin hakimiyyətə gəlişindən sonra müstəqilliklərini itirməyə başladı. Feodal münasibətlərinin inkişafı nəticəsində azad kənd icmalarının torpaq sahələri azalmağa başladı.

Sasani dövlətində hakimiyyətin başında şahənşah dururdu. Ondan sonra ikinci nüfuzlu şəxs baş kahin sayılırdı. "Maqlar maqı" adlanan bu şəxs Azərbaycanın cənubunda yerləşən Qazaka şəhərində otururdu. Sasani hökmdarları onların hakimiyyətinin möhkəmlənməsində böyük rol oynayan atəşpərəst kahinlərinə geniş torpaq sahələri ayırır, onları çoxlu hədiyyələrlə mükafatlandırırdılar.



**Baş kahinin Qazaka şəhərində oturmasının səbəbini izah edin.**

## Mani və Məzdək hərəkatları

III yüzilliyin 40-cı illərində bir çox dinləri özündə birləşdirən maniçilik təlimi yarandı. Təlimin qurucusunun adı bəlli olmasa da, o özünü Mani, yəni "işıq" adlandırırdı. Onun ata və anası Parfiya arşakiləri nəslindən idi. Mani dünya malına uymamağı, heç kimi və heç nəyi incitməməyə çağırırdı. O bu davranışın insanı işığa, nura qovuşduracağına inanırdı.



*Sasani qoşununun oxçuları*

Sasanilərin ərazisində meydana gəlsə də, bu təlim daha çox Mərkəzi Asiya türkləri içərisində yayılmış, Uyğur xaqanlığının rəsmi dövlət dininə çevrilmişdi. Zərdüştilikdən başqa, digər dinlərə dözümsüzlük göstərən Sasani şahı Manini edam etdirdi.



*Mani*

Maninin davamçısı hesab edilən Məzdək də Xeyirlə Şərin daim mübarizə apardığına



*Məzdək üsyanı*


*Məzdək*

inanırdı. O, insanlar arasındakı bərabərsizliyə qarşı çıxır, dünya malının hamı arasında bərabər bölünməsini istəyirdi.

V yüzilliyin 80-ci illərində fəaliyyətə başlayan Məzdəkin tərəfdarları iri feodalların mülklərini dağıdır, onların xəzinələrindəki var-dövlətini kasıblar arasında paylayırdılar. Sasani hökmdarı Məzdəkdən iri feodallara qarşı mübarizədə istifadə etdi. Lakin bu hərəkatın tədricən onun özünə qarşı çevriləcəyindən qorxaraq VI yüzilliyin 20-ci illərində məzdəkilərə divan tutdu.

Məzdəkilər hərəkatı yatırılsa da, hakimiyyətə gələn I Xosrov vergi siyasətində kəndlilərin xeyrinə bəzi güzəştlər etməyə məcbur oldu.


**Mani və Məzdək təlimləri arasında hansı oxşarlıqlar vardır?**


**Mani təliminin mənfi və müsbət cəhətlərini deyin.**

## Sasani dövlətinin süqutu

VII yüzilliyin əvvəlində türklər və Bizansla aparılan müharibələr Sasani dövlətini tamamilə zəiflətmişdi. Belə bir vaxtda onun cənub sərhədlərində güclü Ərəb xilafəti yarandı. Bu dövlətin qurucusu olan Məhəmməd Peyğəmbər Sasani hökmdarı Xosrov Pərvizə İslam dinini qəbul etməyi təklif etmişdi.


*I Xosrov*

Ərəbistan yarımadasında möhkəmlənən müsəlmanların sasanilərlə ilk toqquşmaları Mesopotamiya ərazisində baş verdi. Bizansın da yardımına baxmayaraq, sasanilər ardıcıl olaraq ağır məğlubiyyətlərə uğradılar. Nəticədə Sasani dövləti 651-ci ildə süqut etdi.


**Sasani dövlətinin süqut etməsinin səbəblərini müəyyən edin.**

*Ktesifondakı Sasani sarayının qalıqları*

# Qafqaz VII–XI yüzilliklərdə

Xalqların böyük köçü nəticəsində istər Şimali, istərsə də Cənubi Qafqazda türklərin siyasi nüfuzları və sayları daha da artdı.

Şimali Qafqaz Göytürk xaqanlığının süqutundan sonra Xəzər xaqanlığının tərkibində olmuşdur.



**Xəzər xaqanlığının meydana gəlməsinin əhəmiyyəti nə idi?**

Türklər bölgədə möhkəmlənmək istəyən sasanilərlə, daha sonra isə ərəblərlə uzun müddət mübarizə aparmışdır. Ərəblərin Qafqaza gəlişi bölgədə İslamın yayılmasına səbəb oldu.

Bu dövrdə Qafqazın ən qüdrətli dövləti olan Xəzər xaqanlığı Qafqazda möhkəmlənmək istəyən ərəblərlə yanaşı, Qara dəniz sahillərinə yiyələnmək istəyən Bizansa, həm də şimaldan qarət məqsədilə cənuba soxulmaq istəyən slavyanlara qarşı mübarizə aparırdı. Bu isə dövləti gücdən salırdı.

X yüzillikdə Xəzər xaqanlığı süqut etdi.

*Piyada Xəzər döyüşçüsü*



*Xəzər döyüşçüləri*



Ərəb xilafətinin Qafqazda nüfuzunun zəifləməsi nəticəsində Cənubi Qafqazda bir çox müstəqil müsəlman dövlətləri: Dərbənd, Tiflis və Dumanın (Dumanis) əmirlikləri, Şirvanşahlar, Saci, Salari, Şəddadi dövlətləri ilə yanaşı, Şəki hakimliyi yarandı.



**Sizcə, nəyə görə Sasani dövlətində və Cənubi Qafqazda feodal münasibətləri oxşar şəkildə yaranmış və inkişaf etmişdir?**



***III Baqrat***

Qafqazda ərəblərin hakimiyyətinin zəifləməsi nəticəsində Abxaziya və Kartli qismən müstəqillik qazansa da, Cənubi Qafqazın mərkəzində ən güclü dövləti Tiflis və Dumanın müsəlman əmirlikləri idi.

Azərbaycan ərazisindəki feodal pərakəndəliyindən istifadə edən yəhudi mənşəlli Baqratlı sülaləsinə mənsub abxaz-Kartli (gürcü) hakimləri şərqə doğru hücumları artırdılar. Onlar Bizansın yardımı ilə Cənubi Qafqazın mərkəzi hissəsini də ələ keçirməyə çalışırdılar. Abxaz-Kartli hökmdarı III Baqrat Qaxeti ələ keçirdi. Baqratlı sülaləsinin digər qolu isə Van ətrafında möhkəmlənməyə çalışırdı.

X yüzillikdə baqratlıların Cənubi Qafqazı tamamilə ələ keçirmək cəhdlərinin qarşısı Saci və Salari dövlətləri tərəfindən alındı.

XI yüzilliyin ortalarında Bizansın himayə etdiyi Baqratlı sülaləsi hakimlərinin Cənubi Qafqazda işğalçılıq siyasəti Oğuz-Səlcuq türklərinin bölgəyə axınları nəticəsində tamamilə puça çıxdı.



**Baqratlı sülaləsinin işğalçı planlarının puça çıxmasının səbəblərini izah edin.**

Qafqaz X–XI yüzilliklərdə

ABXAZ ÇARLIĞI
QAXET
KARTLİ
Tiflis
DUMANIN (DUMANİS) ƏMİRLİYİ
TİFLİS ƏMİRLİYİ
ŞƏKİ HAKİMLİYİ
Dərbənd
DƏRBƏND ƏMİRLİYİ
ŞİRVANŞAHLAR DÖVLƏTİ
Şamaxı
Gəncə
Ani
ŞƏDDADİ DÖVLƏTİ
GÖYÇƏ GÖLÜ
BİZANS
RƏVVADİ DÖVLƏTİ
Xəzər dənizi



# ƏRƏB XİLAFƏTİ

**Ərəb xilafəti, İslam dini, Məhəmməd peyğəmbər, "Quran"**

Ərəbistan yarımadası Asiya və Afrika qitələrinin qovuşduqları ərazidə yerləşir. Yarımadanın cənubunda su və yağış bol olduğundan əhali burada daha çox idi. Cənub bölgələrinin əhalisi, əsasən, əkinçiliklə məşğul olurdu. Yarımadanın şimalındakı və mərkəzindəki səhralarda isə köçəri maldarlar – bədəvilər yaşayırdılar.

Bütpərəst ərəblərin ziyarətgahı olan Kəbə Məkkə şəhərində yerləşirdi. Əksəriyyəti bütpərəst olan ərəblər içərisində xristianlığa, yəhudi dininə və zərdüştiliyə inananlar da var idi.



**Ərəblər içərisində müxtəlif dinlərin yayılmasının səbəbi nə idi?**

Ərəblərdə yeni dinin meydana gəlməsi 570-ci ildə Məkkədə anadan olmuş Məhəmməd peyğəmbərin adı ilə bağlıdır. 610-cu ildə 40 yaşında Məhəmmədə peyğəmbərlik verilmiş və o, yeni dini – İslamı təbliğ etməyə başlamışdır. Məkkə şəhərinin əyanları tərəfindən sıxışdı-



*Məkkə*



rılan Məhəmməd peyğəmbər və onun tərəfdarları 622-ci ildə Yəsribə (Mədinə) köçmüşlər. Bəzi müsəlman ölkələrində indi də istifadə edilən Hicri təqvimi bu ildən başlanır.

Müsəlman icmasının başında duran Məhəmməd peyğəmbər, əslində, bütün Mədinə şəhərini idarə etməyə başladı. Məkkəlilər Mədinədəki müsəlmanlar üzərinə yürüş etdilər. 624-cü ildə Bədr döyüşündə müsəlmanlar qələbə qazandılar. **Bu qələbədən bir neçə il sonra – 630-cu ildə müsəlmanlar ilk İslam dövlətinin əsasını qoydular.**



*Məhəmməd peyğəmbərin möhürü*


**Sizcə, yeni din ərəblərin həyatında hansı rol oynadı?**


**İslam dövlətinin meydana gəldiyi dövrdə Azərbaycanda siyasi vəziyyət necə idi?**

*Bədr döyüşü*

İslam dininin təməl kitabı "Quran"dır. "Quran" sözünün mənası "oxumaq" deməkdir. 23 ilə tamamlanmış "Quran" 114 surədən, surələr isə ayələrdən ibarətdir.



İslamı qəbul edən hər bir şəxs aşağıdakı şərtlərə əməl etməlidir:

- Kəlmeyi-şəhadəti ("Allah təkdir, Məhəmməd onun elçisidir") bilməli;
- Namaz qılmalı;
- Ramazan ayı boyunca oruc tutmalı;
- Zəkat verməli;
- İmkan daxilində Məkkədəki Kəbəni ziyarət etməlidir.

Məhəmməd peyğəmbərin vəfatından sonra dövləti xəlifələr (peyğəmbərin müavinləri) idarə etməyə başladılar.

Müsəlmanlar Ərəbistan yarımadasına hakim olduqdan sonra qonşu Bizans və Sasani torpaqlarının fəth edilməsinə başladılar. Müsəlmanların ədalətli davranışlarını görən əhali çox vaxt müqavimət göstərmirdi.

VIII yüzilliyin əvvəllərində ərəblər Şimali Afrika ölkələrini fəth etdilər. 711-ci ildə Tariqin başçılığı ilə müsəlman qoşunları Afrika ilə Avropanı ayıran boğazı keçərək İspaniyaya daxil oldu. Tariqin şərəfinə həmin boğaz indi Cəbəllütariq boğazı adlanır. Vestqotları darmadağın edən müsəlmanlar İspaniyanı tutub, Frank krallığına yürüş etdilər. 732-ci ildə Puatye döyüşündə frankların ciddi müqaviməti ilə qarşılaşan müsəlmanlar Avropanın içərilərinə doğru hərəkətlərini dayandırdılar.

Eyni zamanda Qafqaz və Mərkəzi Asiyanı işğal edən İslam orduları Şərqdə Çinə və Hind vadisinə gedib çıxdılar.

***Puatye döyüşü***

Beləliklə, dövlətin ərazisi VII yüzillik və VIII yüzilliyin I yarısında Atlantik okeanından Hindistan və Çinə qədər uzanan ərazini əhatə etdi. Geniş ərazili bu dövlət Xilafət adlanırdı. Xilafətdə dövlət dili ərəb dili idi.




**Ərəb xilafətini imperiya adlandırmaq olarmı?**

Xilafət torpaqları əmirliklər adlanan vilayətlərə bölünmüşdü. Əsas pul vahidləri qızıl dinar və gümüş dirhəm idi. Əsas vergi olan **xərac** torpaqdan istifadə müqabilində alınırdı. İslamı qəbul etməyən 15 yaşından 60 yaşına qədərki kişilərdən **cizyə** alınır və onlar bunun müqabilində hərbi xidmətdən azad olunurdular.

IX yüzillikdə Misir, Mərkəzi Asiya, Azərbaycan, İran və Əfqanıstan Bağdad xilafətindən ayrıldı. Xilafətin dağılmasında Azərbaycanda yayılan Xürrəmilər hərəkatının, xüsusilə Babəkin azadlıq mübarizəsinin (816–837)böyük rolu oldu.

Xəlifə Mötəsim (833–842) Bizans imperiyasına və Xilafətdəki üsyanlara qarşı mübarizədə türklərdən istifadə edirdi.

IX yüzilliyin II yarısında dövlətdə və orduda türklər mühüm rol oynayırdılar. Xəlifələr tədricən türk hərbi başçılarından asılı vəziyyətə düşürdü. Belə hərbçilərdən biri də Azərbaycan sacilər sülaləsinin əsasını qoyan və Afşin titulu daşıyan Əbu Sac idi.




**Nə üçün Bizans imperiyasına qarşı mübarizədə türklərdən istifadə olunurdu?**

## Xilafət tarixinin dövrləri:

1. *Məhəmməd peyğəmbər və ondan sonra gələn 4 xəlifənin – Əbu Bəkir, Ömər, Osman və Əlinin dövrü.* Bu dövrdə paytaxtı Mədinə və Məkkə şəhərləri olan Ərəb dövləti yeni yaranır və inkişaf edirdi.

2. *Əməvilər sülaləsinin hakimiyyəti (661–750) dövrü.* Bu dövrdə paytaxt Dəməşq (Şam) şəhəri idi.

3. *Abbasilər sülaləsinin hakimiyyəti (750–1258) dövrü.* 762-ci ildə Bağdad şəhərinin əsası qoyulmuş və paytaxt Dəməşqdən Bağdada köçürülmüşdü. Ona görə abbasilər sülaləsinin idarəçiliyi dövrü Bağdad xilafəti də adlandırılır.




**Ərəb dövlətinin tarixinin dövrlərə bölünməsini izah edin.**

## Xilafətdə torpaq sahibliyinin formaları:

1. **dövlət** torpaqları
2. irsən keçən **mülk** torpaqları
3. xidmət qarşılığında verilən və irsən keçməyən **iqta** torpaqları
4. müsəlman dini idarələrinə mənsub olan **vəqf** torpaqları
5. **icma** torpaqları




"Bizlər sizin zənn etdiyiniz kimi dürüst bir millət deyildik. Əziz və cəlil Allah bizləri Həzrəti Məhəmmədin vasitəsilə hidayətə çatdırdı, İslam dini ilə şərəfləndik...

Tüflə (*Tiflisdəki müsəlman icmasının başçısı*) həm də bizə sizin dostluq və sülh içində yaşamaq istədiyinizi söylədi. Mən və mənim yanımdakı möminlər bu anlaşmanı çox istəyirdik. İndi mən sizə Əbdürrəhman ibn Cəz əs-Süləmini göndərirəm. O bizim içimizdə Allahın elmini ən yaxşı bilən və "Quran-i Kərim"i ən yaxşı oxuyandır. Tüflə ilə sizə "aman" (*müqavilə*) göndərirəm. Əgər qəbul etsəniz, o bu müqaviləni sizə verəcəkdir. Əgər bundan çəkinərsinizsə, o zaman sizinlə eyni şərtlərlə müharibə edəcəyik. Şübhəsiz, Allah xain və qorxaqları sevmir".

*Müsəlman sərkərdəsi Həbib ibn Məsləmənin 644-cü ildə Tiflis əhalisinə göndərdiyi məktubdan*

## ƏRƏB XİLAFƏTİ VII–IX YÜZİLLİKLƏRDƏ

- Məhəmməd peyğəmbərin dövründə genişlənmə (630–632)
- İlk xəlifələr dövründə genişlənmə (632–661)
- Əməvi xilafəti dövründə genişlənmə (661–750)

XƏZƏR DÖVLƏTİ

QARA DƏNİZ

İMPERİYASI

XƏZƏR DƏNİZİ

Bağdad

Dəməşq (Şam)

İRAN KÖRFƏZİ

Mədinə (Yəsrib)

Məkkə

QIRMIZI DƏNİZ



Ərəb xilafətinin yaranması və inkişafı nəticəsində baş verən geosiyasi* dəyişiklikləri 38–39-cu səhifələrdəki xəritə əsasında müəyyən edin.

*** Geosiyasi**

*ölkənin coğrafi şəraitinin dövlətin siyasətinə təsir göstərməsi.*



# SAMANİ, OĞUZ, QARAXANLI, QƏZNƏLİ DÖVLƏTLƏRİ

**Samani, Yabqu, Oğuz, Qaraxanlı, Böyük xan, Əfrasiyab, Sultan Mahmud, Qəznə, Dəndənəkan**

Mərkəzi Asiyada baş vermiş xalq hərəkatı xilafətin dayaqlarına zərbə vurdu. Bu hadisələr türk əsilli yerli feodalların dövlət idarəsində fəal iştirakına səbəb oldu.

Üsyanların yatırılmasında xidmətləri olan Saman nəslinin nümayəndələri Mərkəzi Asiyada xilafətin canişinləri təyin olundular.

Samanilər sülaləsinin banisi Saman Xudat olmuşdur. 875-ci ildə mərkəzi Buxara şəhəri olan Samanilər dövlətinin əsası qoyuldu.

Samani dövlətinin mövcud olduğu qısa tarixi dövr ərzində Mərkəzi Asiyada əkinçilik və ticarət inkişaf etmiş, çəltik, pambıq, üzüm və ipək istehsalı artmışdır.

Sənətkarlıq və ticarət şəhərlərin inkişafında mühüm rol oynayırdı.

Ölkənin paytaxtı ilə yanaşı, Səmərqənd, Mərv, Nişapur və Herat da yüksəliş dövrünü yaşayırdı. Tacirlər Şərqi Avropa, Bizans, Çin və Xəzərətrafı ölkələrlə əlaqələr saxlayırdılar.

Samanilər İslam dininin Mərkəzi Asiyada möhkəmlənməsində də böyük rol oynamışdır. X yüzilliyin birinci yarısında dövlət yüksəliş dövrünü yaşayırdı. Bu dövrdə dövlətin ərazisi Mavərənnəhr, Xorasan,





Şimal-Şərqi İranı əhatə edirdi. Bu ərazilərdə əhalinin böyük hissəsi türklər idi. Ona görə də idarəçilikdə türk əyan və sərkərdələri üstünlük təşkil edirdi.

İri feodalların müstəqilləşməsi mərkəzi hakimiyyətin zəifləməsinə səbəb oldu. Bundan istifadə edən qaraxanlılar Samani dövlətinə yürüşlər təşkil etməyə başladı. 999-cu ildə Buxara tutuldu və Samani dövləti süqut etdi.




**Samani dövlətinin süqutunun səbəblərini müəyyən edin.**




**Samani dövlətini xilafətin parçalanması nəticəsində yaranan dövlətlərdən saymaq olarmı?**



*Samanilərin pul vahidi*



*Buxarada Samani hökmdarına aid məqbərə*

# Oğuz dövləti

Oğuz adına ilk dəfə Orxon-Yenisey abidələrində rast gəlinir. “Oğuz” sözü boy, qəbilə və ya tayfa mənalarını verən “ox” sözünün cəm şəkilçisi ilə birləşməsindən əmələ gəlmişdir. “Oğuz” adı ərəbdilli mənbələrdə “quz”, slavyan mənbələrində isə “türk” şəklində işlənmişdir. “Boz ox” və “Üç ox” qollarına ayrılan oğuzlar 24 boydan ibarət olmuşdur.



*Oğuz və oğulları*

Oğuzların böyük hissəsi I və II Göytürk xaqanlıqlarının hakimiyyəti altında olmuşdur. II Göytürk xaqanlığının dağılmasından sonra oğuzlar Uyğur dövlətinin hakimiyyəti altına düşdü.



**Erkən orta əsrlərdə oğuzların əsas məşğuliyyət sahələrini müəyyən edin.**

Mərkəzi Asiyada Seyhun çayı ilə Xəzər dənizi arasında yerləşən boylar 950-ci ildə Oğuz dövlətinin əsasını qoydu. Mərkəzi Yenikənd olan bu dövlət bir sıra mənbələrdə Oğuz *Yabqu dövləti* kimi də tanınır.

Dövlətə yabqu adlanan hökmdar başçılıq edirdi. Yabqudan sonra ölkədə ikinci şəxs sayılan ordu başçısı *subaşı* adını daşıyırdı. Dövlət başçısının köməkçisi *gülərgin* adlanırdı.

Hökmdarın yanında məşvərətçi orqan olan *divan* fəaliyyət göstərirdi.

Göy tanrıya sitayiş edən oğuzlar X yüzilliyin ortalarında İslam dinini qəbul etdilər. İslam və türk mədəniyyətlərini özündə birləşdirən oğuzlar yeni dinin möhkəmlənməsində böyük rol oynadılar.



***Oğuzlar yürüşdə***

Dövlətdə feodalların bir-biri ilə mübarizəsi, hakimiyyət uğrunda çəkişmələr yadelli basqınlara səbəb oldu. Qıpçaqların fasiləsiz hücumları nəticəsində 1000-ci ildə Oğuz dövləti dağıldı. Dövlətin süqutundan sonra Oğuz tayfalarının bir hissəsi Qara dənizin şimalına, oradan da Balkan yarımadasına yayıldı.




**Oğuz dövləti nə üçün süqut etdi?**

***Oğuzlara aid yaşayış məskəni***

# Qaraxanlı dövləti

IX yüzillikdə Şərqi Türküstan, Yeddisu və Tyan-Şan dağlarının ətəklərində Aşina soyuna mənsub olan türkdilli qarluqlar yaşayırdılar. Qarluqlar İkinci Göytürk dövlətinin süqutundan sonra uyğurların hakimiyyəti altına düşmüşdülər.

Qarluqlar 840-cı ildə digər türk tayfalarının iştirakı ilə Qaraxanlı dövlətini yaratdılar. Dövlətin əsasını Qutluq Bilgə Qədir xan qoymuşdur. O, özünü türk dillərində ***Böyük xan*** mənasını verən **Qara xan** adlandırdığı üçün dövlət də Qaraxanlı adlanmışdır.






*Qarluqlar*

İslam mənbələrində qaraxanlılar ***Əfrasiyab sülaləsi kimi*** də tanınır.

Qaraxanlı İslam dinini ilk qəbul edən türk dövlətlərindən biri olmuşdur. Satuk Buğra xanın İslamı rəsmi dövlət dini qəbul etməsi ilə Türküstan ərazisində yaşayan əhalinin böyük hissəsi bu dini qəbul etdi.



**Qaraxanlı və digər türk dövlətlərinin İslam dinini qəbul etməsinin əhəmiyyəti nə idi?**

Qaraxanlı dövlətinin əsas rəqibi Samani dövləti idi. Qaraxanlılar Mərkəzi Asiyanın digər güclü dövləti olan Qəznəlilərlə Samani dövlətinin ərazilərini bölüşdürdülər.

Beləliklə, Qaraxanlı dövlətinin sərhədləri Balxaş gölündən Hindiquş və Qaraqorum dağlarına qədər geniş əraziləri əhatə etdi.

Qaraxanlı dövlətində şəhərlər ticarət yolları üzərində yerləşdiyi üçün inkişaf edirdi. Paytaxt şəhərlər olmuş Kaşğar, Balasaqun, Uzgenlə yanaşı, Səmərqənd, Buxara, Ürgənc və Termez şəhərləri də əsas ticarət mərkəzləri kimi məşhurlaşmışdı.

1042-ci ildə Qaraxanlı dövlətində feodal dağınıqlığı və daxili çəkişmələr artdı. Dövlət Şərqi və Qərbi Qaraxanlı dövlətlərinə parçalandı. XIII yüzilliyin əvvəllərində Şərqi Qaraxanlı qarakitaylar, Qərbi Qaraxanlı isə Xarəzmşahlar tərəfindən süquta uğradıldı.



**Qaraxanlı dövlətinin ərazisində bu gün mövcud olan dövlətlər hansılardır?**



*Qaraxanlı bayrağı*



# Qəznəli dövləti

Samani dövlətinin ən güclü dövründə türk tayfaları Mavərənnəhr vasitəsilə İslam dininin yayıldığı ərazilərdə məskunlaşmağa başlamışdılar. Onların böyük hissəsi Abbasi xəlifələrinin, ərəb və fars əsilli vilayət hakimlərinin qulamları* kimi qulluğa qəbul olunurdu. Dövrün güclü dövlətlərindən olan samanilərin ordularında da türk əsilli qulamların xidmətlərindən istifadə olunurdu.

***Qulam**

*ərəbcə qul, kölə anlamını ifadə edir.*

Samani dövlətində baş verən daxili çəkişmələrdən istifadə edən türk qulamları hakimiyyəti ələ almağa çalışsa da, istəklərinə nail ola bilmədilər. Türk qulamı Alptəkin tabeliyində olan türk əsilli əsgərlərlə Əfqanıstanda yerləşən Qəznə şəhərinə getdi. Burada yerli hakimi uzaqlaşdırdıqdan sonra Qəznədə möhkəmləndi. Beləliklə, 962-ci ildə burada yeni dövlətin – Qəznəli dövlətinin əsası qoyuldu.

Qəznə şəhərinin yerləşdiyi Əfqanıstanda türklərin mövcudluğu İslamdan əvvəlki dövrlərə təsadüf edir. Qəznəli dövlətinin qurulması ilə buraya türk axınları davam etməyə başladı.

Mahmud Qəznəlinin (998–1030) hakimiyyəti dövründə Qəznəli dövlətinin qüdrəti daha da artdı. Samani



***Sultan Mahmud Qəznəli***

dövlətinin qaraxanlılar tərəfindən süquta uğradılması ilə onun əraziləri iki dövlət arasında bölüşdürüldü. Bunun nəticəsində Xorasan, Xarəzm, Sistan və Əfqanıstan tabe edilərək Qəznəli dövlətinin tərkibinə daxil edildi.




İslamın qəbul edilməsindən sonra türk cəmiyyətlərində əhəmiyyətli dəyişikliklər baş verdi. Qaraxanlı və Qəznəlidə köçəri həyat tərzi yaşayan tayfalar oturaq həyat tərzinə keçdi. Şifahi ədəbiyyat tədricən öz yerini yazılı ədəbiyyata verməyə başladı. Memarlıqdan sənətkarlığa, təhsildən elmə qədər bütün sahələr İslamın yayılması ilə böyük bir inkişaf yaşadı. Xarəzm, Buxara, Daşkənd və Səmərqənd kimi şəhərlər elm və sənətkarlıq mərkəzlərinə çevrildi.

Mahmud Qəznəlinin xarici siyasətinin əsasını Hindistanın işğalı tuturdu. Onun hakimiyyətinin böyük dövrünü Hindistana yürüşlər təşkil edir. Bu yürüşlər nəticəsində o, Hindistanın şimal və şimal-qərbində olan məhsuldar torpaqları Qəznəli dövlətinə birləşdirildi. Hindistanın zəngin sərvətlərinə sahib olan Qəznəli dövləti iqtisadi baxımdan möhkəmləndi. Mahmudun bu qələbə xəbəri bütün İslam dünyasına yayıldı. Abbasi xəlifəsi tərəfindən sultan tituluna layiq görülən Mahmud Qəznəli bu mənsəbə yüksələn ilk türk hökmdarı oldu. Sultan Mahmud hakimiyyətini Rey, Həmədan və İsfahan şəhərləri daxil olmaqla Qərbi İrana qədər yaydı. O, ömrünün sonuna yaxın oğuz-səlcuq tayfalarının Xorasanda yerləşməsinə icazə vermişdi.

Sultan Mahmudun ölümündən sonra Qəznəli dövlətində taxt-tac uğrunda mübarizə qızışdı. Daxili ziddiyyətlər, idarəetmənin pozulması dövlətin qüdrətini zəiflətdi. 1040-cı ildə Dəndənəkan döyüşündə səlcuqların qəznəlilərin ordusuna qalib gəlməsi dövlətin nüfuzuna böyük zərbə vurdu.

XII yüzilliyin ikinci yarısında qəznəlilərin türk əsilli Qurlu tayfaları ilə münasibətləri kəskinləşdi. Getdikcə qüvvətlənən qurlular Qəznə şəhərinə hücum edib şəhəri yandırdılar. Qəznəli hökmdarı paytaxtı yeni şəhərə – Lahora köçürməyə məcbur oldu. Bundan sonra onların hakimiyyəti yalnız Şimal-Qərbi Hindistandan ibarət olsa da, qurlular Qəznəli dövlətinə 1187-ci ildə son qoydu.

## Qəznəli dövləti

QARAXANLI DÖVLƏTİ

AZƏRBAYCAN

XƏZƏR DƏNİZİ

ABBASİ XİLAFƏTİ

QƏZNƏLİ DÖVLƏTİ

Qəznə

İRAN KÖRFƏZİ

HİNDİSTAN




Qəznəlilər dövləti necə yarandı?




Mahmud Qəznəliyə sultan titulu verilməsinin səbəbi nə idi?




Sultan Mahmud Qəznəlinin dövlətin güclənməsində rolu nə idi?




Qəznəli dövlətinin tənəzzülünün səbəbləri hansılardır?




Sultan Mahmud Qəznəli ilə Ağ Hun hökmdarı Mihiraqul arasında oxşar xüsusiyyətləri müəyyən edin.



# 8 FRANK DÖVLƏTİ

**German tayfaları, barbarlar, Frank dövləti, Hlodviq, Qalliya, Böyük Karl, Verden müqaviləsi, Feodal dağınıqlığı**

Romalılar Reyn çayından qərbdə yaşayan müxtəlif tayfaları germanlar adlandırırdılar. I yüzillikdə Romanın Reyndən qərbdə yerləşən əraziləri işğal edib, germanları tabe etmək cəhdləri uğursuz olmuşdu.

Germanları tabe etməyi çətin və səmərəsiz sayan Roma yürüşlərini dayandırdı və bütün Reyn çayı boyunca müdafiə istehkamları yaradaraq bu tayfaların hücumlarından qorunmağa çalışdı.

**T** **Romanın germanları tabe etmək cəhdlərinin uğursuz olmasının səbəblərini araşdırın.**

I yüzilliyin əvvəllərində german-alman tayfaları qərbdə Reyn çayından şərqdə Visla çayına, şimalda Baltik və Şimal dənizi sahillərindən cənubda Dunay çayına qədər ərazilərə yayılmışdı. Bu dövrdə onlar hələ ibtidai cəmiyyət halında yaşayırdılar.

Ən mühüm məsələlər (sülh və müharibə, cinayət işləri, tayfa başçısının seçilməsi) xalq yığıncağında həll edilirdi.

Yaşadıqları ərazilərin çox hissəsi meşələrlə örtüldüyündən german tayfalarının əsas məşğuliyyəti maldarlıq və ovçuluq idi.

Roma imperiyasının zəiflədiyi dövrdə german tayfaları Reyn çayı boyunca yerləşən sədləri yarıb imperiya ərazisinə qarətçi yürüşlər etdilər. "Xalqların böyük köçü" zamanı german tayfaları Qərbi Roma imperiyasının bir sıra ərazilərini işğal etdi. İmperiyanın tənəzzülü və



***"Reyn sahilində germanlarla romalılar arasında döyüş"***
***Rəssam Fridrix Tüshaus***



süqutu dövründə onlar burada məskunlaşıb öz dövlətlərini yaratmağa başladılar.

Qot tayfaları İtaliya və İspaniyada, anql və saks tayfaları Britaniyada, vandallar Afrikada, frank tayfaları isə Qalliyada (müasir Fransa) məskunlaşdı.

Bu tayfaların yaratdığı dövlətlər barbar (vəhşi) krallıqlar adlanır. German tayfalarının Qərbi Roma imperiyasının ərazilərinə sahib olması burada Romaya xas olan mədəniyyətin məhvinə səbəb oldu.



**Sizcə, nə üçün German tayfalarının yaratdıqları dövlətlər barbar krallıqlar adlanırdı?**

***German qoşunları Reyn çayını keçərkən***

Frank dövləti

Aahen

BİZANS İMPERİYASI

QARA DƏNİZ

ARALIQ DƏNİZİ

Frank dövlətinin ərazisi

Tabeliyində olan ərazilər

# Frank dövlətinin yaranması



Romalıların yaratdıqları elmi və texniki nailiyyətlər sıradan çıxdı, elm, təhsil tənəzzülə uğradı, şəhərlər dağıdıldı, bəziləri tamamilə yox oldu. Avropa tarixində Roma dövrü başa çatdı, onun yerində german-alman mərhələsi başladı.

German tayfaları bir sıra Avropa xalqlarının formalaşmasına təkan verdi.



**Sizcə, germanlar niyə Roma mədəniyyətini məhv etdilər?**

Qərbi Roma imperiyasının ərazilərində meydana gələn dövlətlər arasında ən uğurlu və uzun ömürlü dövlət Frank krallığı oldu.

Frank tayfaları iki qola ayrılırdı. Onların başçıları özlərini hökmdar adlandırsalar da, əslində, hərbi başçılar idi.

V yüzilliyin sonlarında frank tayfalarının bir hissəsi birləşərək Qalliya istiqamətində yürüşə başladı. Frank tayfalarının ittifaqına Hlodviq başçılıq edirdi. Qərbi Roma imperiyasının süqut etməsinə baxmayaraq, Qalliyanı hələ də keçmiş Roma canişini idarə edirdi.

486-cı ildə Suasson şəhəri yaxınlığında baş verən döyüşdə franklar özünü hökmdar elan etmiş keçmiş Roma canişininin qüvvələrini məğlub etdilər. Hlodviq Qalliyanın bir hissəsini ələ keçirdi. Bir neçə ildən sonra Hlodviq Qalliyaya yürüşdə ona kömək etmiş digər tayfa başçılarını aradan götürdü, özünü Frank dövlətinin kralı elan etdi. Beləliklə, Frank dövləti meydana gəldi.



**Frank dövləti necə yarandı?**






**Qalliyanın nə vaxt və kimin başçılığı altında işğal olunub Roma dövlətinə birləşdirilməsini araşdırın.**

Qalliya ərazilərinin ələ keçirilməsi frankların təsərrüfat həyatında dəyişiklik yaratdı. Onlar kənd təsərrüfatında romalıların təcrübəsinə əsaslanmağa başladırlar. Qullar qalsa da, əksər işlərdə azad insanlar çalışırdılar. Əvvəl franklar torpaqdan birlikdə – icmalıqla istifadə edirdilər. Sonradan torpaqlar ailələr arasında bölündü və qonşuluq icması yaranmağa başladı.

Xristianlığı qəbul etməsi Hlodviqə ruhanilərin və yerli əhalinin rəğbətini qazandırdı və o, Qalliya üzərində hakimiyyətini möhkəmləndirdi. Bu, Roma-german mədəni birliyinin yaranmasına şərait yaratdı. Roma-german birliyi gələcəkdə fransız xalqının formalaşmasına təkan verdi.

Hlodviqin hakimiyyəti dövründə Frank dövlətinin ilk *qanunlar toplusu yaradıldı.* Bu qanunlar frankların qədim adət-ənənələri və Roma hüququ əsasında tərtib olunmuşdu.

Qanunlar IX yüzillikdə də qüvvədə qalırdı.



**Qanunlar toplusunun qəbul edilməsinin əhəmiyyəti nə idi?**



Frankların qanunlar toplusu VI yüzilliyin əvvəllərində, Kral Hlodviqin dövründə latın dilində tərtib edilmişdir. Toplu, əsasən, qayda və qanunların pozulmasına görə cərimələr, həmçinin ailə, vərəsəlik, əşya və mülkiyyətə dair hüquqi məsələləri əhatə edirdi.

## Frank qanunlarından:

- Əgər qul azad adamı öldürərsə, onun sahibi 200 solid* cərimə ödəməli və qulu həmin ailəyə verməlidir.
- Əgər kimsə öküz və ya bahalı inək oğurlayarsa, 35 solid cərimə ödəməlidir. Kral öküzünü oğurlayarsa, 90 solid cərimə ödəməlidir.
- Əgər bir nəfər azad kişini təhqir edərsə, 3 solid cərimə ödəməlidir.
- Əgər kimsə azad qadının şərəfini təhqir edərsə və bunu sübut edə bilməzsə, 45 solid cərimə ödəməlidir.

*** Solid**

*Roma və Bizansda çəkisi 4.5 qr olan qızıl pul vahididir.*



**Sizcə, frankların qadınları xüsusi himayə etmələrinin səbəbləri nə idi?**

# Böyük Karl

Frank dövlətinin ən qüdrətli dövrü **Böyük Karl** (768–814) adlandırılan hökmdarın hakimiyyəti illərinə təsadüf edir.

Karl dövləti xarici təhlükədən qorumaq üçün güclü süvari ordu yaradaraq yürüşlərə başladı.  Müsəlmanlarla gərgin döyüşlərdən sonra o, Pireney yarımadasının şimalında bir vilayəti ələ keçirdi.

Karlın döyüşkən və çoxsaylı saks tayfalarına qarşı apardığı müharibə 30 il davam etdi. Nəhayət, Karl böyük torpaq sahələri bağışlamaqla saks əyanlarını öz tərəfinə çəkib onları sakitləşdirə bildi. Karlın Avar xaqanlığına qarşı apardığı müharibə amansızlığı və qəddarlığı ilə xüsusilə fərqlənirdi.


*Böyük Karl*

İtaliyanın şimalında məskən salıb Roma papasını təhdid edən german tayfasını məğlub edən Karl bu ərazini də öz dövlətinə birləşdirdi. Papa minnətdarlığını bildirmək üçün 800-cü ildə Karlı Romaya dəvət etdi. Təntənəli mərasimdə Papa onun başına qızıl tac qoyaraq imperator elan etdi.

Bizans imperiyası və Ərəb xilafəti ilə diplomatik əlaqələr yaradan Karl ordu toplanmasında dəyişiklik etdi. VIII yüzillikdən frank ordusu, əsasən, süvarilərdən təşkil olunmuşdu. Kəndlilərin çox hissəsi at və silah ala bilmədiyi və at belində döyüşməyi bacarmadığı üçün ordudan uzaqlaşdırılmışdı.

Karl  qohumlarına, frank əyanlarına torpaqlar payladı. Əyanlar bu torpaqlarda yaşayan əhalidən yığdıqları vergilər hesabına özlərinə və dəstələrində olan döyüşçülərə at, silah-sursat almalı idilər. Karlın vaxtında şərti olaraq verilən bu torpaqlar sonradan irsən keçən daimi mülklərə çevrilməyə başladı. İmperatorun bu tədbiri gələcək imperiyanın taleyinə mənfi təsir göstərdi. Onun vəfatından sonra varisləri arasında hakimiyyət üstündə başlanan mübarizə dövləti zəiflətdi. Nəhayət, 843-cü ildə Verden şəhərində Karlın üç nəvəsi öz aralarında bağladığı müqaviləyə əsasən imperiyanı böldü.



**Kəndlilərin ordudan uzaqlaşdırılması nə ilə nəticələndi?**

# Avropa IX–XI yüzilliklərdə

İmperiyanın parçalanması nəticəsində formalaşan üç böyük krallığın ərazisində sonralar **Fransa, Almaniya** və **İtaliya** dövlətləri yarandı. Bu bölünmə Qərbi Avropada iki yüzillikdən çox (IX–XI) davam edən feodal dağınıqlığına səbəb oldu. Bu dövlətlərin hər biri iri feodal mülklərinə, onlar isə daxildə daha kiçik feodallıqlara bölündü. Hər bir iri feodal öz ərazisində müstəqil fəaliyyət göstərirdi: öz pulunu kəsdirir, qanun çıxarır, məhkəməyə başçılıq edir, istədiyi kimi vergi qoyur və onu artıra bilirdi.

Feodal dağınıqlığından ən çox ziyan çəkən kəndlilər oldu. Ver-

*Roma papasının Böyük Karlın başına imperator tacını qoyması*

gini ödəyə bilməyən kəndlilər torpağını itirir və feodallardan asılı vəziyyətə düşürdü. Bu, kəndlilərin təhkimli vəziyyətinə düşməsi ilə nəticələndi. Beləliklə, IX–XI yüzilliklərdə Qərbi Avropada feodal münasibətlərinin formalaşması başa çatdı.



**Frank imperiyasında "feodal nərdivanı"nın əlamətləri özünü necə büruzə verirdi?**

Avropada feodal dağınıqlığı dövrünün ən bariz nümunəsi **Fransa krallığı** idi. Fransa vahid dövlət sayılsa da, ölkə iri feodal mülklərinə bölünmüşdü. X yüzilliyin sonlarında hakimiyyətə Kapetinqlər sülaləsi gəldi. Yalnız paytaxt Paris və Orlean arasındakı torpaqlar kral mülkü hesab olunurdu.

**Almaniyada** iri feodal mülklərinin – hersoqluqların birləşməsi nəticəsində vahid Almaniya krallığı yarandı. Almaniya kralı **I Otto** İtaliyanın şimal hissəsini öz hakimiyyəti altına aldıqdan sonra yerli feodallarla mübarizə aparan Papanın çağırışı ilə 962-ci ildə Romaya gəldi. O, burada papa tərəfindən imperator elan edildi. Bununla da sonralar **Müqəddəs Roma imperiyası** adlanan dövlətin əsası qoyuldu.

**İtaliya** siyasi dağınıqlıq vəziyyətində idi. Roma imperiyası dövründən qalan şəhərlər bərpa olunduqdan sonra dövlət yenidən inkişaf edərək sənətkarlıq və ticarət mərkəzlərinə çevrildi. IX–X yüzilliklərdə bu şəhərlərdən Genuya, Venesiya, Piza, Florensiya özünüidarə hüququ alaraq müstəqil şəhər-respublikalara çevrildi.



# 9 BİZANS. SLAVYANLAR

**Bizans, "Qızıl körpü", Slavyanlar, Kiyev knyazlığı**

Bizans imperiyası (Şərqi Roma) Qədim Roma imperiyasının parçalanması nəticəsində yaranmışdı. Xalqların böyük köçü nəticəsində Bizans dövləti ərazisinin çox hissəsini itirsə də, varlığını qoruyub saxlaya bildi. Əhalisinin çox hissəsini yunanlar təşkil etdiyindən yunan dili dövlət dilinə çevrilmişdi.

Dövlətin başçısı imperator idi. O, qeyri-məhdud hakimiyyətə malik idi. Xarici dövlətlərlə əlaqələr quran imperator qanunlar verir, ali hakim rolunu oynayır və orduya rəhbərlik edirdi.

VII yüzillikdə ərəblərin hücumları nəticəsində Bizans Afrikada və Asiyadakı mülklərinin çoxunu itirdi. Zəifləyən dövlətin əlində Kiçik Asiya, Balkan yarımadasının cənubu və İtaliyada bəzi əyalətlər qaldı.




**Konstantinopolun "Qızıl körpü" adlandırılmasının səbəbini necə izah edərdiniz?**

## "Şəhərlər ölkəsi"

Ölkənin əlverişli coğrafi mövqedə yerləşməsi ticarətin inkişafını şərtləndirirdi. Şərqdən Qərbə, Afrikadan Avropaya gedən ticarət yolları Bizans ərazisindən keçirdi. Ölkənin paytaxtı Konstantinopol bu ticarət yollarının, eləcə də Aralıq dənizindən Qara dənizə keçən yolların kəsişməsində yerləşirdi. Çindən Avropaya gedən Böyük İpək yolu da Bizans ərazisindən keçirdi.

Bizans qızıl pulu bir çox Afrika, Avropa və Asiya ölkələrində istifadə olunurdu. Ticarətin inkişafı ölkədə sənətkarlığın inkişafına şərait yaradırdı. Erkən orta əsrlərdə Bizans özünün zərgərlik məmulatları, silah, şüşə, ipək və müxtəlif ağac, sümükişləmə məmulatları ilə şöhrət qazanmışdı. Ticarətin və sənətkarlığın inkişafı şəhərlərin çiçəklənməsinə səbəb olurdu. Bizans ərazisində 1000-dən çox şəhər olduğuna görə onu "şəhərlər ölkəsi" adlandırırdılar. Ən böyük şəhəri "Qızıl körpü" adlandırılan Konstantinopol idi.

XI yüzillikdə Səlcuq türklərinin qərbə axınları ilə Bizans Kiçik Asiyada bir çox mülklərini də itirdi.

Səlcuq hücumlarının qarşısını ala bilməyən Bizans kömək üçün Roma papasına müraciət etdi. Nəticədə Səlcuqların tutduqları torpaqları geri qaytarmaq üçün xaç yürüşləri təşkil olundu. Bu yürüşlər müvəqqəti olsa da, Bizans üzərinə Səlcuq təzyiqini azaltdı.

Lakin tezliklə Kiçik Asiya yarımadasında yaranmış Osmanlı dövləti 1453-cü ildə Bizans dövlətinin varlığına son qoydu.






## Konstantinopol haqqında XII yüzillikdə yaşamış səyyahın gündəliyindən:

“Deyirlər, təkcə bu şəhərin bazar və dükanlarının icarəyə verilməsindən, quru və dəniz yolu ilə şəhərə gələn tacirlərdən alınan vergilərdən əldə edilən gəliri gündəlik 20 000 qızıl pula çatır. Bu ölkənin sakinləri olan yunanlar qızıl və mirvari ilə çox zəngindirlər. Onlar knyaz övladları kimi qızılla işlənmiş bahalı ipək parçalarda at belində gəzirlər”.



*Bizans ordusu döyüşdə*

Bizans imperiyası XI yüzillikdə

BİZANS İMPERİYASI

QARA DƏNİZ

Konstantinopol

ARALIQ DƏNİZİ

*Bizans döyüşçüsü*




**Xəritə əsasında XI yüzilliyə qədər Bizansın hansı torpaqları itirməsini və bunun səbəblərini müəyyənləşdirin.**

## Slavyanların Bizans ətrafında məskunlaşması

Xalqların böyük köçündə iştirak edənlərdən biri də Slavyan tayfaları idi. VI yüzilliyə qədər slavyanlar Qərbdə Elba çayından Şərqdə Volqanın yuxarı axarlarına qədər olan böyük bir ərazidə məskunlaşdılar. Başlıca məşğuliyyəti əkinçilik olan slavyanlar məhsuldar torpaq axtarışında idilər. Tezliklə onların bir hissəsi Dunay çayı hövzəsinə, oradan da Bizans torpaqlarına – Balkan yarımadasının şimalına köç etməyə başladı. Onlar burada məskunlaşaraq Bizans təbəəliyini qəbul edib vergi verməyə başladılar. VIII yüzillikdə Slavyan tayfalarının parçalanması başa çatdı. Parçalanma nəticəsində slavyanlar Şərq, Qərb və Cənub slavyanlarına bölündü.






**Məhsuldar torpaq axtarışında olan slavyanları köçəri adlandırmaq olarmı?**



**Hazırda hansı slavyan xalqlarının dövlətləri olduğunu araşdırın.**

## Slavyan dövlətlərinin meydana gəlməsi

IX yüzillikdə Şərq slavyanlarının ilk dövləti Kiyev knyazlığı yarandı. Natural təsərrüfatın hakim olduğu dövlət daxilən möhkəm olmadığı üçün Kiyev knyazlığı tezliklə parçalandı. XIII yüzilliyin əvvəllərində dağınıq rus knyazlıqları monqol hücumuna məruz qaldı. Monqollardan asılı vəziyyətə düşən rus knyazlıqları Qızıl Ordu dövlətinə vergi verməyə başladı.



**Sizcə, monqolların rus torpaqlarını asanlıqla ələ keçirməsinin səbəblərindən biri ölkənin dağınıqlıq dövrü yaşaması ola bilərdimi? Fikrinizi necə əsaslandırarsınız?**

*Slavyanlar*

# 10 MƏDƏNİYYƏT

**Göytürk yazıları, mədrəsə, İbn Sina, xəttatlıq, Müqəddəs Sofiya məbədi, Karolinq oyanışı**



Türk xalqlarının islamaqədərki mədəniyyətində yazının özünəməxsus yeri vardır. Qədim türk əlifbası 34 samit və 4 sait olmaqla 38 hərfdən ibarət idi. Kitabələrdəki mətnlər sağdan sola və yuxarıdan aşağıya yazılırdı. Orxon-Yenisey abidələri türk xalqlarına məxsus mühüm yazılı mənbələrdir. V–VIII yüzilliklərə aid abidələr türk xalqlarının yüksək mədəni nümunələr yaratdığını sübut edir. Bunların ən əhəmiyyətliləri Göytürk yazılarıdır.

İslamaqədərki dövrdə türk xalqları Göy Tanrı dininə inanırdı. Orxon-Yenisey abidələrində türkün tanrı övladı olması inamı və türklərin tanrı himayəsində yaşaması etiqadı əksini tapmışdı.

Qədim türklər memarlıq və incəsənətin də inkişafına öz töhfələrini vermişlər. Onlar şəhərlər salmış, öz xaqanlarının şərəfinə heykəllər ucaltmış və yaşayış tərzlərini əks etdirən rəsmlər çəkmişlər.



**Orxon-Yenisey abidələrinə dair əlavə məlumatlar toplayın.**

*Orxon-Yenisey əlifbası*



# İslam mədəniyyəti

Ərəblər tərəfindən işğal olunmuş ərazilərdə İslam dininin yayılması nəticəsində yeni bir mədəniyyət formalaşdı. İslamın yayıldığı ərazilərdə ərəb dili elmi və ədəbi dilə çevrildi. Dövlət işləri ərəb dilində aparılır, məktəblərdə ərəb dili tədris olunur və dini ibadətlər bu dildə yerinə yetirilirdi. Qədim Avropa və Şərq xalqlarının mədəniyyəti öyrənilir, müxtəlif dillərdə olan elmi və ədəbi əsərlər ərəb dilinə tərcümə olunurdu.

Geniş ərazili xilafətdə təsərrüfatın inkişafı, böyük şəhərlərin olması və İslam dininin yayılması mədəniyyətin inkişafına təkan verdi. Məscidlərin yanında fəaliyyət göstərən məktəblərdə müqəddəs "Quran" və ərəb dili öyrədilirdi. Məktəbi bitirənlər təhsillərini mədrəsələrdə davam etdirirdi. Alimlərin dərs dediyi mədrəsələrdə dini biliklərlə yanaşı, riyaziyyat, astronomiya və təbabətə aid elmi biliklər də verilirdi.

Əl yazısı ilə meydana gələn kitablar mədrəsələrin zəngin kitabxanalarını bəzəyirdi. Sonralar isə Avropada mədrəsələrin nümunəsində ali məktəblər yaradılacaqdı.

Təhsilin inkişafı nəticəsində elmi biliklər sürətlə yayılırdı. Xilafətdə elmi biliklərin bir çox sahələri inkişaf edirdi. Sənətkarlıq və ticarətin inkişafı da buna təsir göstərirdi. Hind rəqəmlərindən istifadə edən ərəblər cəbr elminin əsasını qoydular.

***Kufi xətti ilə yazılmış "Quran"dan iki nümunə***





**Sizcə, ərəbdilli İslam mədəniyyətinin meydana gəlməsinin səbəbləri hansılardır?**

Aristotelin əsərlərinin izahını verdiyinə görə böyük alim ***Fərabini*** "ikinci müəllim" adlandırırdılar. Fərabi də Aristotel kimi elmi biliklərin təsnifatını vermişdir.


*Fərabi*

Xarəzmdə yaşamış ***Əbu Reyhan əl-Biruni*** müxtəlif elm sahələri ilə məşğul olmuş, Şərqdə diametri təqribən 5 metrə yaxın olan ilk qlobusu düzəltmişdi. O, Yerin Günəş ətrafında fırlanması fikrini irəli sürmüşdü.


***Əbu Reyhan əl-Biruni***

Ərəb xilafətində astronomiya elmi də inkişaf etmişdi. Rəsədxanalarda çalışan astronomlar Yer kürəsinin təxmini ölçülərini hesablamışdılar.

"Elmlərin şeyxi" adlandırılan məşhur müsəlman alimi ***İbn Sina*** tibbə dair əsərləri ilə şöhrət qazanmışdı. Görkəmli Azərbaycan alimi Bəhmənyarın müəllimi olmuş İbn Sinanın əsərləri uzun müddət Şərqdə və Avropa ölkələrində tibb üzrə əsas dərslik olmuşdur. Xilafətdə tarix elmi də inkişaf etmişdi. ***Bəlazuri*** ərəb işğallarına həsr olunan ilk tarix əsərini yazmışdı. Xilafətin iki yüzillik tarixini qələmə alan ***Təbəri*** xürrəmilər hərəkatı haqqında da məlumat vermişdi.

Ərəb ədəbiyyatının "qızıl dövrü" Abbasi xilafətinin hakimiyyəti dövrünə təsadüf edir. Ərəbdilli ədəbiyyatın inkişafında xilafətə daxil olan bütün xalqların nümayəndələri iştirak edirdi.

Xilafət dövründə memarlıq çox inkişaf etmişdi. Yeni şəhərlər salınır, əsil sənət əsəri olan memarlıq abidələri inşa olunurdu. Tikililər içərisində əsas yeri məscidlər tuturdu. Samirə şəhərindəki ***Ulu məscid*** dövrün gözəl memarlıq nümunəsi idi.


*İbn Sina*

Kitabların üzünün köçürülməsi nəticəsində ***xəttatlıq*** sənəti inkişaf etməkdə idi. Xilafət dövründə vahid İslam mədəniyyətinin formalaşması nəticəsində müsəlman ölkələri dünyanın ən qabaqcıl ölkələri hesab olunurdu.



**Ərəb xilafəti dövründə rəssamlıq və heykəltaraşlığın inkişaf etməməsinin səbəblərini araşdırın.**





**İslam ölkələrində ərəb dilinin elm dili olmasının mədəniyyətin inkişafına hansı təsirləri oldu?**

*Ulu məscid*

# Bizans və Avropa mədəniyyəti

Erkən orta əsrlərdə Bizans mədəniyyəti inkişaf etməkdə idi. Bu mədəniyyət, əsasən, qədim Roma və ellin ənənələrindən bəhrələnmişdi. Bizans şəhərləri yalnız sənətkarlıq və ticarət mərkəzləri deyil, həmçinin mədəniyyət ocaqları idi.

VII yüzillikdən başlayaraq yunan dili imperiyanın dövlət dilinə çevrildi. Təhsil və elm inkişaf etdi. Bizansda savadlı adamların sayı Qərbi Avropadakından daha çox idi. XI yüzillikdə Konstantinopolda universitet açıldı. Burada hüquq və fəlsəfə fakültələri fəaliyyət göstərirdi.

Orta əsrlər memarlığının inkişafında Bizansın özünəməxsus yeri vardır. İmperator Yustinianın əmri ilə Konstantinopolda tikilmiş Müqəddəs Sofiya məbədi Bizans memarlığının möhtəşəm nümunəsidir. Osmanlılar Konstantinopolu ələ keçirdikdən sonra məbədi məscidə çevirdilər.

Antik dünyadan orta əsrlərə keçid dövründə Qərbi Avropada mədəniyyət tənəzzül etdi. Savadlı adamlar, əsasən, din xadimləri idi. Kilsə məktəblərində dərslər latın dilində keçirilirdi. Bu dildə isə o zaman heç bir xalq danışmırdı.

Frank imperatoru Böyük Karl təhsilə, elmə və mədəniyyətə böyük diqqət göstərirdi. O, məktəblər açdırır, saraya müxtəlif ölkələrdən savadlı adamlar dəvət edir, paytaxt Aahendə daşdan saraylar və kilsələr tikdirirdi.



*Bizans mozaikası*

Böyük Karlın tədbirləri nəticəsində mədəniyyətdə yüksəliş baş verdi. Frank imperiyasının tənəzzülünə qədər davam etmiş həmin dövrü "Karolinq oyanışı" adlandırırlar.




**Bizans və Qərbi Avropa mədəniyyətlərini müqayisə edin.**




Beş ilə inşa olunmuş Müqəddəs Sofiya məbədinin tikintisinə on min adam cəlb olunmuşdu. İmperator buranı baş məbədə çevirmək istəyirdi. Bu nəhəng binanın ölçüsü 76,5 x 68,4 metr, hündürlüyü isə 51 metrdir. Dördkünc əsas binanın üzərində nəhəng günbəz var. Məbədin iç divarları və sütunlarına müxtəlif rəngli mərmərdən üz çəkilmiş və mozaikalarla* bəzədilmişdir.

*** Mozaika**

*eyni və ya müxtəlif rənglərdə şüşə, daş hissəcik və piltələrdən hazırlanmış incəsənət nümunəsidir.*



*Aya Sofya*



# BÖYÜK SƏLCUQ DÖVLƏTİ

**Səlcuqlar, Çağrı bəy, Toğrul bəy, Nişapur, Malazgird döyüşü**

Oğuz dövlətində subaşı (ordu başçısı) vəzifəsini Qınıq boyundan Səlcuq bəy icra edirdi. Bir müddətdən sonra Oğuz dövləti ilə arası dəyən Səlcuq bəy ətrafında olan Oğuz tayfaları ilə Aral gölünə doğru köç etdi. Bu köçün əsas səbəbi yer və otlaq çatışmazlığı idi.

Səlcuq bəy Cənt şəhərinə gəldi. Ondan əvvəl köç etmiş müsəlman türkləri də burada yaşayırdılar. Səlcuq bəy özünə tabe olan oğuzlarla birlikdə müsəlman oldu. Bundan sonra onlar türkmən adlanmağa başladı. İslam dinini qəbul etməsi bölgədə Səlcuq bəyin nüfuzunu artırdı və digər türk-müsəlman tayfalarının onun ətrafında cəmləşməsinə şərait yaratdı. Bu amil Oğuz dövlətinə qarşı mübarizədə onun işini asanlaşdırdı.



*Səlcuq bəy*



**Səlcuqların regionda nüfuzunu artıran amillər hansılar idi?**

Səlcuq bəyin vəfatından sonra onun varisləri səlcuqlar adı ilə tanındılar. Mübarizəni onun oğlanları və nəvələri davam etdirmişdir. Bu mübarizədə hələ babalarının sağlığında idarəçilik təcrübəsinə yiyələnmiş nəvələri, iki qardaş: Çağrı bəy və Toğrul bəy xüsusilə fərqlənirdi.

Qaraxanlı və Qəznəli hökmdarları qardaşların rəhbərlik etdiyi səlcuqlara qarşı birlikdə mübarizə aparırdılar. Ancaq bu mübarizə səlcuqları daha da gücləndirdi.



*Səlcuq əyanının fiquru*



Səlcuqlar siyasi təzyiqlərdən, yer darlığından və otlaq çatışmazlığı səbəbindən Anadoluya da axın etdilər.

İki qardaşın başçılıq etdiyi səlcuqlar Qərbə – Anadoluya geniş miqyaslı bir kəşfiyyat yürüşü etmək qərarına gəldi. Yürüşə rəhbərlik edən Çağrı bəy 1015-ci ildə Bizansın şərq əyaləti olan Van gölünün ətrafına çataraq Bizansı və onun himayə etdiyi tayfaları darmadağın etdi.

Bir müddət burada möhkəmlənmə işləri apardıqdan sonra geri qayıtdı. Bu yürüş nəticəsində onlar növbəti yurd sala biləcəkləri yeri müəyyənləşdirdilər.



**Bizansa kəşfiyyat yürüşünün nəticəsini müəyyən edin.**

Səlcuqlar ətraflarındakı tayfalarla birlikdə XI yüzilliyin 30-cu illərində qəznəlilərin hakimiyyəti altında olan Xorasana köçməyi qərara aldılar. Onlarla toqquşmadan ehtiyat edən Qəznəli Sultan Məsud bəzi əraziləri səlcuqlara verməyə məcbur oldu.



Bu dövr mənbələrində Bizansın şərq əyalətlərində görünən Çağrı bəyin süvariləri haqqında "Yel kimi uçan atlar üstündə uzun saçlı, yaylı və mizraqlı türkmənlər... " – deyə söz açılır.



Ədaləti, zəkası, cəsarəti və siyasi dünyagörüşü ilə fərqlənən Toğrul bəy Səlcuqlu dövlətinin ilk sultanıdır. O, hakimiyyəti dövründə təməlini atdığı Böyük Səlcuqlu imperatorluğunu dünya dövləti səviyyəsinə qaldırmış, dini dövlətdən ayırmışdır. Qardaşı Çağrı bəy və onun oğlanları ilə birlikdə İslam dünyasında əməvilər və abbasilərdən sonra yeni bir Türk-islam yüzilliyinin əsasını qoymuşdur. Türklər Yaxın Şərqi fəth edərək xəlifəni öz himayələri altına aldılar və İslam dünyasının ağası oldular.



*Çağrı bəy*

Səlcuqlar onlara verilən ərazilərlə kifayətlənməyib **1038-ci ildə** Nişapur şəhərini ələ keçirdilər. Beləliklə, mərkəzi **Nişapur** şəhəri olan qüdrətli türk dövləti – **Böyük Səlcuq dövləti** yaranmış oldu.

Toğrul bəy burada Səlcuq idarə üsulunu qurmağa və təşkilatlanmağa başladı.

Bundan xəbər tutan Sultan Məsud Hindistan səfərini yarımçıq saxlayıb geri döndü. 1040-cı ildə 300 döyüş fili, 50 minlik ordu toplayıb səlcuqların üzərinə hərəkət etdi.

Bu ordu say baxımından səlcuqlardan üstün idi. Dövrün tarixçiləri bu ordunu *"Bütün Türküstanın belə qarşısında*



***Sultan Toğrulun Bağdada daxil olması***

***Dəndənəkan döyüşü***

*dura bilməyəcəyi qədər böyük və təchizatlı bir ordu"* olduğunu qeyd edirdilər.

Səlcuqlar Mərv yaxınlığında, Dəndənəkan qalası ətrafında həlledici döyüşə girdilər. Üç gün davam edən döyüşlərdə səlcuqlar qəznəlilər üzərində parlaq qələbə qazandılar. Dəndənəkan qələbəsi səlcuqların Mərkəzi Asiyada mövqeyini möhkəmləndirdi, İrana və İraqa yollarını açmış oldu. Toğrul **sultan** elan edildi.



**Sizcə, nə üçün səlcuqlar sayca üstün olan qəznəlilərə qalib gəldilər?**

Dəndənəkan qələbəsindən sonra **Mərv şəhərində böyük qurultay** toplandı. Qurultayda yeni ərazilərin ələ keçirilməsi, Qaraxanlı və qəznəlilərlə toqquşmaqdansa, dağınıqlıq olan digər ərazilərə: Bizansa, Cənubi Qafqaza, xüsusilə Azərbaycana yürüşlər edilməsi qərara alındı. Yürüşlərin yaxın məsafədən idarə olunması üçün paytaxt 1043-cü ildə **Rey** şəhərinə köçürüldü. Qısa müddət ərzində böyük ərazilər tabe edildi.



*Alp Arslan*

1054-cü ildə **Cənubi Qafqaza** yürüş edildi. Bu yürüşdə əsas məqsəd bölgənin müsəlman dövlətlərini öz tərəfinə çəkmək və digər dövlətlərə qarşı mübarizədə onların qüvvəsindən istifadə etmək idi.

Sultan Toğrul hakimiyyətini Abbasi xəlifəsinin mənəvi nüfuzu ilə gücləndirmək üçün 1055-ci ildə **Bağdada** daxil oldu. Abbasi xəlifəsi də Sultan Toğrula tabe olduğunu bildirdi və onu "Şərqin və Qərbin hökmdarı" elan etdi. Bundan sonra xəlifənin əlində yalnız dini hakimiyyət qaldı. Beləliklə, Sultan Toğrulun hakimiyyəti dövründə səlcuqlar Amudəryadan Fərat çayına qədər böyük ərazilərin sahibi oldu.

Sultan Toğrulun oğul varisi olmadığından onun vəfatından sonra hakimiyyətə Çağrı bəyin oğlu **Alp Arslan (1063–1072)** keçdi. O, ilk vəzifə kimi Oğuz birliyini qorumaq, dövləti daha da gücləndirmək üçün hərəkətə keçdi. Alp Arslan Bizansla əlaqə saxlayan erməni, gürcü və abxazları məğlub edib, Tiflis, Ani və Qars şəhərlərini ələ keçirdi. Onun əsas məqsədi isə Anadolunu türk torpağına çevirmək idi.



**Sultan Toğrulun Bağdad səfərinin türk dünyası üçün nəticəsini dəyərləndirin.**

*Səlcuq pulları*





*Səlcuq Sərkərdəsi*



Alp Arslan Bizansla döyüşə başlamazdan əvvəl onların sarayına elçilər göndərərək sülh təklif etdi. Lakin Roman Diogen onlara cavabında: “İsfahanmı, yoxsa Həmədanmı yaxşıdır? Mən İsfahanda, atlarım isə Həmədanda qışlayacaq”. Türk elçisi isə cavabında: “Atların Həmədanda qışlayar, sənə gəlincə bu, hələlik məlum deyil”.



*Malazgird döyüşü*



*Turan taktikası*

Bizans imperatoru Roman Diogen bütün kişiləri, hətta Anadoluda yaşayan oğuzları və peçeneqləri orduya cəlb etdi. Artmaqda olan türk təhlükəsinin qarşısının alınması üçün Avropa dövlətlərindən də kömək istənildi. Bu tədbirlərdən sonra Diogen türk təhlükəsinin qarşısını alacağına və əvvəldən Anadoluya gələn türkləri də birdəfəlik buradan çıxaracağına əmin oldu. Bizans ordusu bu tədbirlərdən sonra Malazgird istiqamətində irəliləməyə başladı.

Tərəflər 1071-ci ilin avqustunda **Malazgird düzənliyində** qarşılaşdı. Türk süvariləri hər tərəfdən hücuma keçsə də, nəticəsiz oldu. Bu zaman türk ordusu “**Turan taktikası**”na əsasən döyüşə-döyüşə və pusqular quraraq geri çəkilməyə başladı. Döyüşün gedişində oğuzlar və peçeneqlər də öz soydaşlarının tərəfinə keçdilər. Vəziyyətin ağırlığını görən imperator geri çəkilmək əmri verdi. Bundan istifadə edən Alp Arslan onların üzərinə qəti hücuma keçərək döyüşün taleyini həll etdi. Yaralanmış imperator türk sərkərdələri tərəfindən əsir götürüldü.

Alp Arslan böyük mərdlik göstərərək Bizans imperatorunu bağışladı və onunla sülh müqaviləsi bağladı. Sülhün şərtlərinə əsasən Bizans hər il səlcuqlara vergi ödəməli və Şərqi Anadolunu türk torpağı kimi qəbul etməli oldu.

Dünya tarixində Malazgird döyüşü mühüm dönüş nöqtəsi hesab edilir. Çünki bu döyüşün nəticəsi olaraq Anadolu həmişəlik türk torpağı oldu. Bu uğurlu döyüşdən sonra Abbasi

xəlifəsi Alp Arslanı "Müsəlmanların xilaskarı" və "İslamın nuru" adlandırdı.



**Malazgird döyüşünün dünya tarixində rolu nə oldu?**

Alp Arslan 1072-ci ildə böyük bir ordu ilə Qaraxanlı torpaqlarına yürüşə başladı. Lakin sui-qəsd nəticəsində öldürüldü. Hakimiyyətə oğlu **I Məlikşah (1072–1092)** gəldi. I Məlikşahın hakimiyyəti illəri Səlcuq dövlətinin siyasi qüdrətinin çiçəklənmə dövrü idi. Hələ atasının zamanında vəzir olan **Nizamülmülk** Məlikşahın hakimiyyəti illərində də ona yaxından kömək oldu.

I Məlikşah hakimiyyətinin ilk günlərindən ölkədə daxili sabitliyi qoruyub saxlamağa və Şərq sərhədlərini möhkəmləndirməyə başladı. İmperatorluğun mərkəzini İsfahana köçürən Məlikşah yeni yürüşlər üçün hazırlıq görməyə başladı.

O, qaraxanlıları məğlub edib asılı vəziyyətə saldı və vergi verməyə məcbur etdi. Məlikşahın hakimiyyəti illərində dövlət qərbdə Aralıq dənizinədək olan böyük bir ərazini əhatə edirdi.

I Məlikşah iqtisadiyyatın inkişafına şərait yaradan addımlar atmışdı. Belə ki vahid ölçü, çəki və pul sistemləri yaratmış, karvan yollarının təhlükəsizliyini təmin etmiş və tacirləri bəzi rüsumlardan azad etmişdi.

# Dövlətin süqutu

1092-ci ilə Məlikşahın ölümündən sonra varislərinin dövründə dövlət tədricən tənəzzül etməyə başladı.



**Sultan I Məlikşahın dövründə dövlətin çiçəklənmə səbəbləri nə idi?**

Uzun sürən ara müharibələri və tabe edilən xalqların üsyanları dövləti zəiflətdi. Bu zəiflik Avropa xaçlılarının hücumlarının qarşısını almağa imkan vermədi və Aralıq dənizi sahillərində bəzi ərazilər itirildi.

Sonuncu Səlcuq sultanı **Səncər** qaraxanlı və qəznəlilərə qarşı uğurlu hərbi əməliyyatlar aparsa da, monqol əsilli qarakitaylara məğlub oldu. Qarakitaylar Mavərənnəhri ələ keçirdilər. Qeyri-müsəlman tayfanın Səncəri məğlub etməsi müsəlman əhali arasında onu nüfuzdan saldı və bir  çox ərazilər itirildi.

1157-ci ildə Sultan Səncərin vəfatından sonra Böyük Səlcuq dövləti süqut etdi.

**Böyük Səlcuq dövləti**

BİZANS
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ
ARALIQ DƏNİZİ
Rey
Nişapur
İsfahan
BÖYÜK SƏLCUQ DÖVLƏTİ
İRAN KÖRFƏZİ
QƏZNƏLİ
QIRMIZI DƏNİZ
MİSİR
ƏRƏBİSTAN
HİND OKEANI



**Böyük dövlətlərin süqut etməsinə səbəb olan amilləri müəyyən edin.**



# BÖYÜK MONQOL İMPERİYASI. QIZIL ORDU. MOSKVA KNYAZLIĞI



**Çingiz xan, Qaraqorum, noyon, bahadır, "Böyük yasa", yarlıq, tarxan, baskak, knyaz, "Uqra görüşü", çar**

Qədim zamanlardan etibarən monqollar Mərkəzi Asiyanın çöllərindən Altay dağlarının qərbinə qədər geniş ərazilərdə yaşayırdılar. Ərazinin təbii quruluşu əkinçiliyə yararlı olmadığı üçün monqolların məşğuliyyəti, əsasən, ovçuluq və köçəri maldarlıq idi.

XII yüzillikdə artıq monqollar arasında qəbilə münasibətləri dağıldı. Tədricən maldar təsərrüfatlar içərisində sosial bərabərsizlik yaranmağa başladı. Daha varlı təsərrüfatlar əsas tayfadan ayrılmağa və digər ərazilərə köç etməyə başladı. Tayfalararası çəkişmələr, iqlim şəraiti, otlaq sahələri uğrunda mübarizələr monqolları yeni ərazilərə köçməyə sövq edirdi. Ona görə də yenicə yaranmağa başlayan feodal münasibətləri köçmə xarakteri daşıyırdı. Bu dövrdə monqol çölləri qəbilələrarası toqquşmalara meydan olurdu.

Çingiz xandan qabaq dağınıq halda olan monqollar tədricən yeni birləşmələr – **ordular** yaratdılar. Hərbi təşkilat olan orduların başında **bahadırlar** və **noyonlar** dururdu. Özlərinə tabe olan tayfaların sayını artırdıqca onlara böyük xan tərəfindən yeni ad – **xan** adı verilirdi.

Monqol tayfalarından birinin başçısı Temuçin nayman, kerait və merkit tayfalarını məğlub etdikdən sonra 1206-cı ildə Onon çayı sahilində ona tabe olan tayfaların başçılarının iştirakı ilə qurultay çağırdı. O bu qurultayda böyük xan seçildi və Çingiz adını qəbul etdi (1206–1227). Beləliklə, Böyük Monqol xaqanlığının əsası qoyuldu. **Qaraqorum** şəhəri yeni dövlətin paytaxtı seçildi.



**Monqol dövlətinin yaradılmasında Çingiz xanın rolu nədən ibarətdir?**





*Çingiz xan*



Monqolların uğurları, əsasən, Çingiz xanın iti ağlı və uzaqgörən xüsusiyyətləri ilə əlaqədar idi. Çingiz xan ən çətin anlarda müstəqil və doğru qərarları ilə hakimiyyətini möhkəmləndirirdi. Hətta tabe edilən ərazilərdə baş verən üsyanları qəddarlıqla yatırır, kütləvi qətliamlardan çəkinmirdi. Ordusunda ciddi nizam-intizam yaradaraq qanunlara tabe olmayanları edam etdirirdi.



*Çingiz xan*

Çingiz xan geniş işğallara başlamaq üçün güclü ordu yaratmalı idi. Bu məqsədlə tabe edilən ərazilərin hamısı göndərdikləri əsgərlərin sayına uyğun olaraq onluqlara, yüzlüklərə və minliklərə bölündü. Çingiz xan tayfa başçılarına və noyonlara ordudakı əsgərlərin sayından asılı olaraq **onbaşı, yüzbaşı** və **minbaşı** rütbələri verdi.

Monqolların qanunlar məcəlləsi **"Böyük yasa"** və ya "Çingiz xan yasaları" adlanır. Çingiz xan bu yasalarında itaət altına alınmış xalqları ədalətlə idarə etməyi hədəfə almışdı. Hamı "Böyük yasa"ya and içməli və onun bütün maddələrinə sözsüz əməl etməli idi. Bu yasalar müqəddəs hesab olunur, tabe olmayanlar ölümlə cəzalandırılırdı. "Böyük Yasa"ya görə bütün tabe edilmiş torpaqlar və xalqlar xan nəslinin mülkiyyəti sayılırdı. Bu səbəbdən Çingiz xan onları oğulları arasında uluslara böldü.



*Monqol əsgərinə aid dəmir dəbilqə*




**Monqollarda hərbi təşkilat necə qurulmuşdu?**




**"Böyük Yasa" adlandırılan qanunlar toplusunun mahiyyətini izah edin.**

Monqol imperiyası

MONQOL İMPERİYASI
Qaraqorum
Pekin
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ
ARALIQ DƏNİZİ
İRAN KÖRFƏZİ
HİNDİSTAN
SAKİT OKEANI
HİND OKEANI


*Monqol süvarisi*

# Monqol işğalları

Çingiz xan geniş çöllərdə yaşayan bütün monqol və türk tayfalarını birləşdirdikdən sonra işğallara başladı. Sərt intizamlı güclü hərbi təşkilata malik olan idarəetmə sistemi yaradıldı. Qoşunda nizə ilə silahlanmış çevik atlı dəstələri ordunun əsas zərbə qüvvəsi idi. Əvvəlcə işğal edilməli ərazi seçilir, dəqiq kəşfiyyat məlumatları toplanmaq üçün oraya ticarət karvanları göndərilirdi. Həmin vasitələrlə ərazinin dəqiq məlumatları əldə edildikdən sonra

qəfil hücum təşkil olunurdu. İşğal olunan ərazilərdə şəhərlər və kəndlər yandırılır, əhali qılıncdan keçirilirdi. Bu, qorxu yaradaraq yeni ərazilərin işğalı zamanı əhalinin müqavimətini qırmaq məqsədilə edilirdi. İşğal olunan ərazilərdə feodal dağınıqlığının hökm sürməsi, ara müharibələri və vahid dövlətin olmaması monqol yürüşlərinə rəvac verirdi. Çox vaxt bu ölkələrin hökmdarları xalq kütlələrini silahlandırıb monqollara qarşı göndərməkdən qorxurdular.

1207-ci ildə Çingiz xan qalibiyyətli hərbi səfərlərə başladı. Çinin işğalına qədər Sibir və Şərqi Türküstanı özünə tabe etdi. 1215-ci ildə Pekin şəhəri daxil olmaqla şimali Çinin işğalı başa çatdırıldı. Çində həlledici müvəffəqiyyətə imza atan Çingiz xan əsas hərbi qüvvələrini qərbə yönləndirdi və Xarəzmşahlar dövlətinə hücum etdi.



*Monqol ordusu Çin səddində*



**Şimali Çinin işğal edilməsinin əhəmiyyətini izah edin.**



*Xarəzmşahlarla döyüş*

Güclü ordusu olmasına baxmayaraq, Xarəzmşah Məhəmməd monqollarla açıq döyüşə girməkdən çəkindi. O daha çox şəhərlərin qala divarlarını möhkəmləndirməklə müqavimətə üstünlük verdi. Çingiz xan Xarəzmşahlar dövlətinin əsas mərkəzlərinə eyni vaxtda hücum etmək üçün ordunu hissələrə böldü. Şəhərlər dağıdıldı, əhalinin bir qismi qılıncdan keçirildi. Xarəzmşah Məhəmməd monqollara müqavimət göstərə bilmədi. Onun ölümündən sonra müqaviməti oğlu Cəlaləddin aparsa da, istəyinə nail ola bilmədi. Beləliklə, Mərkəzi Asiyanın işğalı başa çatdırıldı.


Çingiz xan Pekinə daxil olarkən

Xarəzmşahın oğlu Cəlaləddini təqib edən Cəbə və Subutayın orduları İrandan keçərək Cənubi Qafqaza qədər irəlilədi. Bu yürüşlər gələcəkdə Cənubi Qafqazın işğalı üçün zəmin yaratdı. Monqollar 1222-ci ildə Dərbənd keçidindən keçərək Şimali Qafqaza gəldilər. Burada birləşmiş rus-qıpçaq qoşunlarını məğlub edib ölkələrinə qayıtdılar.

Köçəri monqolların oturaq əkinçilik bölgələrinə basqınları viranedici idi. Çingiz xan və onun sərkərdələri əkinçilik bölgələrinin və şəhərlərin dağıdılmasını, onların əhalisinin məhv edilməsini ənənəyə çevirdi. Belə bir taktikanın seçilməsinə səbəb işğal edilmiş geniş əraziləri nəzarət altında saxlamaq üçün monqolların ordusunun yetərli olmaması idi. Müqavimət göstərə biləcək əhalinin kütləvi qırğınlarında əsas məqsəd xalqları qorxutmaq, zəiflətmək və yerlərdə işğalçılara qarşı üsyanların qarşısını almaq idi.

1235-ci ildə paytaxt Qaraqorumda keçirilən qurultayda rus çöllərinə və Avropanın cənub-şərq hissəsinə yürüşlər etmək haqqında qərar qəbul olundu. Çingiz xanın nəvəsi Batı xanın başçılıq etdiyi monqol ordusu İdil bulqarlarını və rus knyazlarını tabe etdi, Polşa, Macarıstan və Çexiyaya daxil oldu.

Böyük Monqol xaqanının ölüm xəbəri Batı xanın yürüşlərinin dayanmasına səbəb oldu. Uzunmüddətli yürüşlər nəticəsində əsgərlərin yorulması, ordu sıralarının pozulması, işğal edilən ərazilərdə baş verən xalq üsyanları Batı xanın Avropanın içərilərinə irəliləməsinə mane oldu.

Xubilay xanın hakimiyyəti dövründə paytaxt Qaraqorumdan Pekinə köçürüldü. O, Cənubi Çini işğal edib 1271-ci ildə özünü Çin imperatoru elan etdi və Yuan sülaləsinin əsasını qoydu.

XIV yüzilliyin əvvəllərində Monqol imperiyası parçalandı və onun geniş ərazilərində müstəqil feodal dövlətləri yarandı. Bir müddət sonra Çində baş verən üsyan nəticəsində Yuan monqol sülaləsinin hakimiyyətinə son qoyuldu.


*Monqollar yürüşdə*


**Monqol işğallarının əhatə etdiyi ərazilərdə hansı müasir dövlətlər mövcuddur?**

# Qızıl Ordu dövləti

Çingiz xan hələ sağlığında böyük imperatorluğu oğlanları arasında bölüşdürmüşdü. Xarəzm, Şimali Qafqaz, Qıpçaq çölü və gələcəkdə qərbə tərəf işğallar zamanı əldə olunan ərazilər onun böyük oğlu Cuciyə verilmişdi. Cuci xanın ölümündən sonra həmin ərazilər oğlu Batı xana verildi. Monqolların qərbə yürüşləri nəticəsində XIII yüzilliyin 40-cı illərində Qızıl Ordu dövlətinin əsası qoyuldu. Dövlətin ilk paytaxtı İdil çayı sahilində salınmış Saray Batı şəhəri idi.

Qızıl Ordu adı monqol dilində çadır mənasını verən "ordu" sözündən əmələ gəlmişdir. Xanların düşərgələrində xan çadırının üstü qızılı rəngdə örtüklə örtüldüyü üçün bu çadırın adı "Qızıl ordu" adlanırdı. Zaman keçdikcə Cuci ulusu kimi də xatırlanan bu dövlət Qızıl Ordu dövləti kimi tanınmağa başladı.

İlk vaxtlar Böyük Monqol imperatorluğundan asılı olan Qızıl Ordu XIII yüzilliyin sonlarında tam müstəqil idarə olunmağa başladı. Geniş torpaqlara sahib olan Qızıl Ordunun ərazisində yaşayan xalqlar içərisində türklər çoxluq təşkil edirdi. Azlıqda qalan köçmə monqollar türk tayfaları ilə qaynayıb qarışaraq onların dilini, adət-ənənələrini mənimsədilər. Özbək xanın hakimiyyəti dövründə İslam dininin qəbul olunması ilə ölkədə türkləşmə prosesi başa çatdı.

Qızıl Ordu dövlətinin başında **böyük xan** adlandırılan hökmdar dururdu. Onun yanında məşvərət orqanı kimi **ali məclis** fəaliyyət göstərirdi. Vergiləri **baskak** adlı məmurlar toplayırdı. Qızıl Orduda feodal münasibətlər formalaşırdı. Feodallar içərisində bəzi imtiyazlı şəxslər – **tarxanlar** vergidən azad olunmaları haqqında böyük xandan yarlıq (fərman) alırdılar.

Məmur özbaşınalıqları, vergilərin çoxluğu xalqın narazılığını artırırdı. Baş verən üsyanlar monqol ağalığına zərbə vurur, tabe olan ölkələrin müstəqillik meyillərinə təkan olurdu.




**Qızıl Ordu dövlətində idarəçilik sistemi necə qurulmuşdu?**



***Batı xan***



***Monqol döyüşçüsü***

## Qızıl Ordu dövləti

RUS KNYAZLIQLARI
QIZIL ORDU
BALTIK DƏNİZİ
Saray Batı
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ


XIII yüzilliyin ikinci yarısında Qızıl Ordunun təxmini ərazisi


Qızıl Orduya tabe olmuş rus knyazlıqlarının ərazisi

Qızıl Ordunun zəifləməsindən istifadə edən rus knyazları Moskva knyazı ətrafında birləşərək 1380-ci ildə Kulikovo çölündə Mamay xanı ağır məğlubiyyətə uğratdılar.

Əmir Teymurun köməyi ilə taxta çıxan Toxtamış xan 1382-ci ildə Moskvanı tutdu və Teymurdan asılı olan ölkələrə qarətçi yürüşlər təşkil etdi. Bu hadisələr Əmir Teymurla toqquşmalara gətirib çıxardı. 1395-ci ildə Terek çayı sahilində Toxtamış xan məğlub oldu. Qızıl Ordunun şərq vilayətləri Teymurilər dövlətinin tərkibinə qatıldı. Bu hadisələrdən sonra Qızıl Ordu bir daha özünə gələ bilmədi və parçalanmağa başladı. Ara müharibələri nəticəsində XV yüzillikdə Qızıl Ordunun tərkibindən bir sıra ərazilər ayrıldı. Qazan, Həştərxan, Krım xanlıqları və Noqay Ordusu kimi müstəqil dövlətlər yarandı.

Qızıl Ordu dövlətinin itirilmiş qüdrətini bərpa etmək arzusuna düşən Əhməd xan 1480-ci ildə Moskva knyazlığı üzərinə yürüş etdi. Uqra çayı sahilində birləşmiş rus knyazları ilə qarşılaşan Əhməd xan onlarla toqquşmaqdan çəkindi. Tarixdə **"Uqra görüşü"** kimi tanınan hadisələr nəticəsində Moskva knyazlığının Qızıl Ordudan vassal asılılığına son qoyuldu. Daxili çəkişmələrə və ara müharibələrinə məruz qalan Qızıl Ordu dövləti XVI yüzilliyin əvvəllərində süqut etdi.


**Qızıl Ordunun əhalisinin əsas hissəsini kimlər təşkil edirdi?**


**Qızıl Ordunun zəifləməsinə hansı amillər səbəb oldu?**


**Qızıl Ordunun parçalanması nəticəsində meydana gəlmiş türk xanlıqlarının ərazisini xəritədə müəyyən edin.**

# Moskva knyazlığı

XIV yüzilliyin əvvəllərində Moskva knyazlığı özünün yüksəliş dövrünü yaşayırdı. Rus torpaqlarından xərac alan Qızıl Ordu xanları rus şəhərlərinə hücumlara ara verdilər. Buna görə də şəhər həyatında yüksəliş baş verdi, rus şəhərlərinin qızğın ticarət həyatı bərpa olundu. Moskva iri sənətkarlıq və ticarət mərkəzinə çevrildi. Xarici təhlükələr də ölkənin birləşdirilməsi zərurətini yaradırdı. Knyazlıq Qızıl Ordu xanlarından “Böyük knyaz” titulunu almaq üçün mübarizəyə başladı. Moskva knyazı Qızıl Ordu xanından yarlıq aldı.

Moskva knyazlığı artıq Qızıl Ordu ilə hesablaşmır, xəracı vaxtlı-vaxtında ödəmirdi. O, işğallar yolu ilə öz ərazisini genişləndirməyə başladı.

XV yüzilliyin ikinci yarısında knyaz III İvanın dövründə rus knyazlıqlarının Moskva knyazlığı ətrafında birləşdirilməsi sürətləndi. Bu proses XVI yüzilliyin əvvəllərində başa çatdı. Vahid Rusiya dövləti yarandı. 1533-cü ildə IV İvan böyük knyazlıq taxtına əyləşdi. O, 1547-ci ildə çar titulu qəbul etdi. IV İvan Qroznı ilk rus çarı oldu.

O, mərkəzləşmiş idarəetmə sistemini təşkil edərək dövlət aparatını təkmilləşdirdi, hərbi sahədə qayda-qanun yaratdı. Mərkəzi hakimiyyətə qarşı çıxan qüvvələrə divan tutuldu.

Rusiyanın işğalçılıq planlarında Volqaboyu ərazilərə yiyələnmək əsas məqsəd sayılırdı. Türk xanlıqları daxilində baş verən qarşıdurmalardan istifadə



*İvan Qroznı*

edən Rusiya XVI yüzilliyin ikinci yarısında Qazan, Həştərxan və Sibir xanlıqlarını işğal etdi.

Beləliklə, Rusiya Şərq ölkələri ilə birbaşa ticarət əlaqələri saxlamaq imkanları qazandı.




**Türk xanlıqlarının işğal edilməsinin Rusiya dövləti üçün əhəmiyyəti nə idi?**

**Moskva knyazlığı XV yüzillikdə**

# 13 DEHLİ SULTANLIĞI. BÖYÜK MOĞOL DÖVLƏTİ

**Qütbəddin Aybək, Sultan Əlaəddin, Panipat döyüşü, Babur şah, Əkbər şah**


*Qütb Minar*

Ağ Hun, Qəznəli və digər türk dövlətlərinin Hindistanın şimalına yürüşü nəticəsində bölgədə türk tayfalarının siyasi üstünlüyü təmin edilmişdi. Bu üstünlük Hindistanın şimalında türk dövlətlərinin meydana çıxmasına şərait yaratmışdı. Həmin dövlətlər **Dehli sultanlığı** və **Böyük Moğol dövləti** idi. Hindistanın böyük hissəsi, xüsusilə şimalı VI yüzillikdən XIX yüzilliyin ortalarına qədər türklərin hakimiyyəti altında olmuşdur.


*Aybəkin ölüm səhnəsi*

 **Hindistanın şimalında türk-müsəlman əhalinin artmasının səbəbi nə idi?**

 **Dehli sultanlığı hansı şəraitdə yarandı?**

## Dehli sultanlığı

Sultanlıq 1206-cı ildə qıpçaq türkü olan **Qütbəddin Aybək** tərəfindən yaradılmışdır. Aybək ölkədə türk əhalisinin sayını artırmaq və türk dilini hakim dil etmək üçün çalışırdı. Onun İslam dininin Hindistanda geniş yayılmasında böyük xidmətləri olmuşdur.

Qütbəddin Aybəkin varisi olmadığı üçün ölümündən sonra kürəkəni **Eltutmuş** hakimiyyətə gəldi. O, Şimali Hindistanda bəzi əraziləri tutaraq mövqeyini möhkəmləndirdi və monqol təhlükəsinin qarşısını aldı. Eltutmuş monqol hücumlarından canlarını qurtarmaq istəyən xeyli sayda türk tayfalarını qəbul etmiş və Şimali Hindistanda türk mədəni həyatının davamlılığını təmin etmişdir. Müsəl-





Öz dövrünün böyük fatehlərindən olan Aybək Hindistanın şimal ərazilərini tabe etmişdi. Comərd, adil, himayəçi bir hökmdar olan Aybək həmçinin mədəniyyətin də inkişafına şərait yaratmış, Hindistanda bir çox məscid və məqbərələr tikdirmişdir.

Digər türk sultanları kimi o da idmanı sevirdi. Aybək 1210-cu ildə "Çövkən" oyunu zamanı atdan yıxılmış və bu onun ölümü ilə nəticələnmişdir.



manların dini başçısı olan Abbasi xəlifəsi tərəfindən Hindistan sultanı kimi tanınması onun müstəqil sultan kimi qanuniliyini gücləndirmişdi. Hakimiyyətinin son dövrlərində dövlətin sərhəd ərazilərinin mərkəzə sədaqətini gücləndirmək üçün iqta sistemini həyata keçirmiş, nizami ordu yaratmış, adına pullar kəsdirmişdir.



*Dehli sultanlığının pulları*

XIII yüzilliyin sonlarında hakimiyyətə gələn Əlaəddin uğurlu hərbi əməliyyatlar keçirərək Cənubi Hindistanı da tabe etdi. **Sultan Əlaəddin** özünün hakimiyyəti dövründə kifayət qədər uğur qazanmışdı. O, vergi sistemini nizama salmış, ölkə iqtisadiyyatını sabitləşdirmiş və monqol təhlükəsinin qarşısını tamamilə almışdı.

XIV yüzilliyin sonlarında Dehli sultanlığının zəifləməsindən istifadə edən **Əmir Teymur** buraya hücum etmiş və qarətlər törətmişdi. Əmir Teymurun Dehlini qarət etməsi ölkədə vəziyyəti daha da ağırlaşdırmışdı. Bəzi ərazilər isə ayrılaraq müstəqil olmuşdu.



**Sultan Əlaəddinin hansı addımları Dehli sultanlığını möhkəmləndirdi?**



**XIV yüzilliyin sonlarında Dehli sultanlığının zəifləməsinin daxili və xarici səbəblərini müəyyən edin.**

# Böyük Moğol dövləti

XVI yüzilliyin əvvəllərində Hindistanda dağınıq halda olan Dehli sultanlığı və bir sıra müstəqil hakimlər var idi. Əmir Teymurun nəslindən olan Babur **1526-cı ildə** Dehli sultanlığına hücum etdi. Həlledici döyüş **Panipat** yaxınlığında baş verdi. Babur qalib gələrək Dehli sultanlığının varlığına son qoydu. Hindistanda yeni türk dövlətinin – Böyük Moğol dövlətinin əsası qoyuldu. Aqra yeni dövlətin paytaxtı oldu. Babur şah bir sıra hind hakimlərini məğlub edib Hindistanda hakimiyyətini gücləndirdi.



**Böyük Moğol dövləti hansı şəraitdə yarandı?**



*Babur*



Onun "Baburnamə"si Yuli Sezarın "Xatirə"lərindən daha ciddi və daha səmimidir. Belə ki Babur düşmənlərinin qüsurlarını sayarkən onların üstün cəhətlərini də qeyd etmiş, mərdanəlik göstərmişdir.

İki böyük sərkərdənin – Çingiz xan və Əmir Teymurun varisi olmasına baxmayaraq, öz şəxsi zəkası və fəaliyyəti ilə Hindistanda elə bir səltənət yaratmışdı ki, bu türk səltənəti sonda Hindistanda müsəlman türk və buddist hindlilərinin qarışığından yeni bir xalqın – Pakistan xalqının tarix səhnəsinə çıxmasına səbəb olmuşdu.




Əkbər şahın hakimiyyət illəri (1556–1605) Böyük Moğol dövlətinin ən güclü dövrü hesab olunur. O, lazımi tədbirlər görərək daxili sabitliyi təmin etdi. Sosial dəyişikliklər nəticəsində Hindistanda dini dözümlülük möhkəmləndirildi, hindlilərlə müsəlmanların hüquq bərabərliyi təmin olundu. Əkbər şah uğurlu xarici siyasət yürüdərək Osmanlı, Səfəvi, Özbək və Portuqaliya dövlətləri ilə yaxşı əlaqələr qurdu.



**Əkbər şahı islahatçı hökmdar hesab etmək olarmı? Fikrinizi əsaslandırın.**



*Əkbər şah*

# 14 OSMANLI İMPERİYASI

**Qayı boyu, Osman Qazi, Sultan I Murad, İstanbul, Ankara döyüşü, Süleyman Qanuni, yeniçəri**

Anadoluya türklərin yerləşməsi Alp Arslanın Malazgird döyüşündəki qələbəsindən sonra daha da sürətlənmişdi. Böyük Səlcuq dövlətinin parçalanması nəticəsində meydana gəlmiş dövlətlərdən biri də **Anadolu Səlcuq sultanlığı** idi.





**Osmanlı dövlətinin yaranmasının əhəmiyyəti nə idi?**

XIII yüzilliyin I yarısında monqolların təzyiqi ilə Mərkəzi Asiya və Azərbaycanda yaşayan bəzi türk tayfaları da bu dövlətin ərazisinə sığınmışdı. Anadolu Səlcuq sultanları bu tayfaları, əsasən, Bizansla sərhəd ərazilərdə yerləşdirirdilər. Belə tayfalardan biri də **Qayı** boyu idi. Söyüd adlı yer qayılara qışlaq, Domaniçi isə yaylaq yeri olaraq verilmişdi.

Anadolu Səlcuq sultanlığının zəifləməsi nəticəsində qayıların bəyi **Osman Qazi** 1302-ci ildə müstəqil oldu. Yeni yaradılan müstəqil müsəlman-türk dövləti onun qurucusunun adı ilə **Osmanlı** adlandırıldı. Osmanın nüfuzunun artmasında onun sənətkarlara və xristian əhalisinə xoş münasibət göstərməsi böyük rol oynadı.



*Osman Qazi*

Osmandan sonra hakimiyyətə onun oğlu **Orxan Qazi** gəldi. Orxan Qazinin hakimiyyəti dövründə (1326–1362) fəth olunan Bursa şəhəri Osmanlının paytaxtı oldu. Bursa şəhərinin mühasirəsi və fəthi zamanı Azərbaycanın Xoy şəhərində yaşayan Geyikli




*Orxan Qazinin* Bursanın fəthindən sonra şəhərə girişi


*Orxan Qazi*

(Maralllı) Baba da öz tərəfdarları ilə Osmanlı ordusuna köməyə gəlmişdi.

Orxan Qazinin öz ərazilərini genişləndirmək təşəbbüsü Bizans tərəfindən narahatçılıqla qarşılandı. Maltəpə yaxınlığında Osmanlı ordusu ilə Bizans qoşunu üz-üzə gəldi. Döyüşün taleyini Osmanlı ordusundakı oxçular həll etdilər.

Bizanslıları darmadağın edən Orxan Qazi dövlətinin ərazisinin şimalda Qara, cənubda isə Egey dənizi sahillərinə çıxışını təmin etdi. O, Osmanlı dövlətinin ərazisini inzibati baxımdan paşalıqlara və sancaqlıqlara böldü.



**Orxan Qazinin fəaliyyətini dəyərləndirin.**


*Osmanlı süvariləri*



*Konstantinopolun mühasirəsi*

# Osmanlı dövlətinin yüksəlişi

Orxan Qazidən sonra hakimiyyətə gələn oğlu **Murad** sultan elan edildi. Onun hakimiyyəti dövründə paytaxt Ədirnəyə köçürüldü. 1371-ci ildə azsaylı Osmanlı ordusu Çirmən döyüşündə Balkan yarımadasına yiyələnməyə çalışan Serbiya krallığının 70 minlik qoşununu darmadağın etdi. Serb əsgərlərinin çoxu geri qaçarkən çayda boğulmuşdu.

Serblərin Çirməndəki məğlubiyyətin əvəzini çıxmaq niyyəti boşa çıxdı. Onlar 1389-cu ildə Kosovo döyüşündə daha ağır məğlubiyyətə uğradılar.



**Osmanlı dövlətinin Balkanlardakı rəqibləri hansı dövlətlər idi?**

I Muraddan sonra hakimiyyətə oğlu Sultan I İldırım Bəyazid gəldi. O, Niqbolu döyüşündə səlibçilərin birləşmiş qüvvələri üzərində qələbədən sonra Bolqarıstanı tabe edərək Balkan yarımadasında Osmanlının mövqelərini daha da gücləndirdi. I İldırım Bəyazidin əsas diqqəti Bizansın paytaxtı Konstantinopolu tutmağa yönəlmişdi. Bu məqsədlə o, Konstantinopolun ətrafında xeyli istehkamlar və qalalar inşa etdirdi. Lakin Osmanlı dövləti Əmir Teymurun hücumuna



***Sultan I Muradın qələbədən sonra döyüş meydanını yoxlaması (Ön planda əlində bıçaqla hücum edən serbdir.)***



Sultan Süleymanın dövründə Osmanlının əraziləri daha da genişləndi. Tarixdə “Möhtəşəm” və “Qanuni” adları ilə tanınmış Sultan Süleymanın hakimiyyət illərində Osmanlı özünün qüdrətli zirvəsinə çatdı. Bu dövrdə osmanlılar Avropanın içərilərinə qədər irəlilədi və Şimali Afrikada xeyli ərazilər ələ keçirdilər.




**Sizcə, nə üçün Sultan Süleyman "Qanuni" adı ilə tanınırdı?**

*Konstantinopolun fəthi*

məruz qaldı. 1402-ci ildə Ankara yaxınlığındakı döyüşdə Əmir Teymur Osmanlı üzərində qələbə qazandı. Bu döyüşdə Osmanlının məğlubiyyətinə sevinən Roma papası 3 gün fasiləsiz olaraq kilsə zənglərinin çalınması barədə göstəriş vermişdi.

Dövlətin qüdrətini bərpa edən Sultan II Mehmet 1453-cü ildə Konstantinopolu tutdu. Şəhərin adı dəyişdirilərək İstanbul qoyuldu və paytaxt oraya köçürüldü. Bu qələbədən sonra “Fateh” adı qazanan II Mehmet həm qərbdə, həm də şərqdə geniş ərazilər ələ keçirdi.

Sultan Səlimin isə əsas hücum hədəfi şərqdəki türk-müsəlman dövlətləri – Azərbaycan Səfəvi dövləti və Misir Məmlük sultanlığı oldu. Azərbaycanda möhkəmlənə bilməyən I Səlim Misiri Osmanlı dövlətinin tərkibinə qatdı.





*Sultan Səlim*



*Sultan Süleyman*





Osmanlı dövlətinin tarixinə dair zaman oxu tərtib edin.



# Osmanlı dövlətinin idarə olunması

Osmanlı dövlətində bütün hakimiyyət sultana məxsus idi. XVI yüzilliyin 20-ci illərindən başlayaraq Osmanlı sultanları həm də bütün dünya müsəlmanlarının xəlifəsi elan edildi. Sultandan sonra dövlətdə ikinci vəzifəli şəxs baş vəzir idi. Bu vəzifəyə sultanın yaxın qohumu təyin olunurdu. Baş vəzir vilayətlərin idarəçiliyinə, vergilərin toplanmasına nəzarət edir, sultanın möhürünü saxlayırdı. Ali məsləhət şurası Divan adlanırdı. Maliyyə işlərinə dəftərdar nəzarət edirdi.

Əhali iki hissəyə ayrılırdı: idarə edənlər və idarə olunanlar. İdarə edənlər dedikdə dövlətin silahlı qüvvələrində və idarəçiliyində vəzifə tutanlar nəzərdə tutulurdu. İdarə olunanlar isə ümumi şəkildə rəiyyət adlanırdı.

Osmanlı silahlı qüvvələri içərisində yüngül silahlanmış **suvarilər** və piyada **yeniçərilər** mühüm rol oynayırdı. Yeniçərilər, əsasən, valideynsiz qalan uşaqlardan təşkil olunurdu. Onlar xüsusi hərbi məktəblərdə təlim keçdikdən sonra yeniçəri birliyinə daxil olurdular.

Torpaqların əksəriyyəti dövlətə məxsus idi. Əsgərlərə, xırda dövlət məmurlarına verilən torpaq sahələri *timar* adlanırdı. XIV yüzilliyin sonlarından başlayaraq qoşun başçılarına və iri məmurlara *ziyamət* adlı daha geniş torpaq sahələri verilməyə başlanıldı.



**Sizcə, nə üçün qoşun başçılarına və iri məmurlara daha geniş torpaq sahələri verildi?**

*Yeniçəri*



Osmanlı dövləti
Paytaxt
Şəhər
RUMELİ
QARA DƏNİZ
Ədirnə
İstanbul
Ankara
Bursa
ANADOLU
XƏZƏR DƏNİZİ
URFA
ARALIQ DƏNİZİ
MİSİR
QIRMIZI DƏNİZ
İRAN KÖRFƏZİ

# 15 TEYMURİ DÖVLƏTİ

**Teymur, Şahrux, Hüseyn Bayqara, Şeybanilər**

Teymuri dövlətinin yaradıcısı türk dünyasının böyük fatehi Əmir Teymur olmuşdur. Türküstanda doğulan Teymur Cağatay ulusunun türkləşmiş Barlas qəbiləsindən idi.

O, hələ cavan yaşlarında hərb işini yaxşı öyrənmək üçün Səmərqənd hakiminin yanında xidmətə getmiş, nümunəvi addımları ilə onun hörmətini qazanmışdı.

Hərbi səfərlərə qatılan Teymur mühüm əməliyyatlarda iştirak edir, bacarığı ilə düşmənin məğlub edilməsində böyük xidmətlər göstərirdi. Bu xidmətlərinə görə Teymur hətta mükafatlandırılmışdı.

Səmərqənd hakiminin vəfatından sonra hakimiyyətə oğlu Əmir Hüseyn keçdi. O da atası kimi hərbi əməliyyatlarda Teymurun bacarığından istifadə etmək qərarına gəldi. Bunun üçün Teymurla ittifaqa girdi.

Teymur da Hüseynlə olan münasibətlərini daha da möhkəmləndirmək üçün onun bacısı ilə evləndi.

Teymur və Əmir Hüseynin birləşmiş qüvvələri Cağatay hakiminin üzərinə hücuma keçsə də, onlar məğlub oldular. Cağatay hakiminin Səmərqəndi ələ keçirib orada möhkəmlənmək cəhdi uğursuzluqla nəticələndi. Üsyan qaldıran əhali monqolları şəhərdən qovdu. Bundan sonra Səmərqəndə



**Əmir Hüseyn və Teymur arasındakı ittifaq haqqında müzakirə aparın.**

*Əmir Teymur*



daxil olan Əmir Hüseyn və Teymur ölkəni birgə idarə etməyə başladılar. Çox keçmədən müttəfiqlər arasında başlanan mübarizə 1370-ci ildə Teymurun qələbəsi ilə başa çatdı. O, qurultay çağıraraq "əmir" və ya "Turan əmiri" titulunu qəbul etdi, yeni dövlətin – **Teymuri dövləti**nin əsasını qoydu. Dövlətin paytaxtı Səmərqənd şəhəri oldu.

Teymurun əsas məqsədi güclü dövlət yaratmaq və feodal dağınıqlığını aradan qaldırmaq idi. Güclü monqol əmirlərinin köməyini qazanmaq üçün yeni torpaqlar və hərbi qənimətlər lazım idi. Buna görə də o, böyük müharibələrə başladı.

Teymur yaxşı anlayırdı ki, güc yolu ilə yaradılan dövləti ancaq qanunlarla qorumaq olar. Bunun üçün o, "Teymurun qanunları" adlı qanunlar toplusu tərtib etdirdi.



# Əmir Teymurun fəthləri

Hakimiyyətinin ilk illərində Əmir Teymur bütün Mərkəzi Asiyanı ələ keçirdi. Ancaq Xarəzmin tabe edilməsi XIV yüzilliyin sonlarına qədər ləngidi.

Əmir Teymur digər qüdrətli dövlət olan Qızıl Ordu ilə uzunmüddətli mübarizə aparmalı oldu. Bu mübarizədə Qızıl Ordu hökmdarı Toxtamış xan xüsusilə fərqlənirdi. Toxtamış xanın hakimiyyətə gəlməsində Əmir Teymurun böyük rolu olsa da, hakimiyyət əldə etdikdən sonra o, Qafqaz və Ön Asiya uğrunda Teymurla mübarizəyə başladı. Toxtamış xanın iddiasına görə, bu ərazilər Çingiz xanın vəsiyyətinə əsasən onlara çatmalı idi. Mübarizə 1395-ci ilə qədər davam etdi. Terek çayı sahilində baş verən həlledici döyüşdə Əmir Teymur Toxtamışı ağır məğlubiyyətə uğratdı. Döyüş nəticəsində əmir Teymur Qızıl Ordunun zəngin



*Teymur hərbi yürüşdə*





*Ankara savaşı*

ərazilərini, xüsusilə şərq vilayətlərini ələ keçirdi.

Əmir Teymur zəngin sərvətləri olan Hindistana yürüş etmək istəyirdi. Bu dövrdə Hindistanda hakimiyyətdə Dehli sultanlığı idi. Sultanlıqla hakimiyyət uğrunda aparılan mübarizə onu zəiflətmiş, xarici hücumlara şərait yaratmışdı. Əmir Teymur yaranmış vəziyyətdən istifadə etmiş, XIV yüzilliyin sonlarında Hindistana hücum edərək buranı işğal etmiş və zəngin sərvətlərini ələ keçirmişdi.

XV yüzilliyin əvvəllərində Teymur dövrün digər böyük türk dövləti olan Osmanlı ilə toqquşmalı oldu. Bunun bir sıra səbəbləri var idi. Teymur Kiçik Asiyaya yürüş etməklə bəzi xırda hakimlərin osmanlılara qarşı çıxmasına şərait yaratdı. Onlar müstəqilliklərini bərpa etmək üçün Teymura müraciət etmişdilər. Teymurun hələ XIV yüzilliyin sonlarında məğlub etdiyi Qaraqoyunlu Qara Yusif və Cəlairi sultanı Əhməd də Osmanlı sultanı I İldırım Bəyazidə sığınaraq ona qarşı kömək istəmişdilər. Teymur onları Bəyaziddən istəsə də, rədd cavabı almışdı. Həmçinin o, Ön Asiyanın mühüm ticarət mərkəzlərinə sahib olmaq istəyirdi. Bütün bunlar onların arasındakı toqquşmanı qaçılmaz etdi. 1402-ci ildə Ankara yaxınlığında teymurilərlə osmanlılar arasında döyüş baş verdi. Əmir Teymurun Hindistandan gətirdiyi döyüş filləri də toqquşmanın gedişinə həlledici təsir göstərdi.

Ankara döyüşündə Əmir Teymur qalib gəlsə də, bu bütün türk dünyasının gələcəyi üçün faciəli oldu. Osmanlıların Qərbə doğru irəlilədiyi bir dövrdə baş verən bu döyüş Avropanı xilas etmiş oldu. Beləliklə, Teymuri dövləti Qobi səhrasından Balkan yarımadasınadək olan geniş ərazilərə sahib oldu.

Əmir Teymurun vəfatı Çin üzərinə yürüşün baş tutmamasına səbəb oldu.



**Ankara döyüşünün türk dünyası üçün nəticələrini dəyərləndirin.**

# İmperiyanın daxili siyasəti

Teymurun müharibələri çox amansız idi. Çingiz xandan fərqli olaraq o, yürüşlərdə iqtisadi məqsədlər də güdürdü. Ölkənin iqtisadiyyatını inkişaf etdirmək üçün ələ keçirdiyi ölkələrdən bacarıqlı və seçilmiş sənətkarları ölkəsinə gətirirdi. Başqa yerlərə gedən ticarət yollarını, xüsusilə Asiyadan Avropaya gedən yolları nəzarətdə saxlayırdı. Əmir Teymur Avropa ölkələri ilə birbaşa ticarət əlaqələri yaratmaq siyasəti yeridirdi. Bu addımla Teymur Avropa-Asiya ticarətində Səmərqəndin rolunu artırmaq istəyirdi.



**Əmir Teymurun yürüşlərində iqtisadi məqsəd nə idi?**

Teymur daxili siyasətində nüfuzlu müsəlman ruhanilərindən də istifadə edirdi. O, İslam dininin nüfuzunun artırılmasında

böyük xidmətlər göstərmişdir. Əmir Teymur da Çingiz xan kimi dövləti uluslara bölmüşdü. Ulusları idarə edən valilər müəyyən qədər əsgər verməli, vergilərin yığılması və mükəlləfiyyətlərin yerinə yetirilməsinə nəzarət etməli idi.

# Teymuri dövlətinin zəifləməsi və süqutu

Əmir Teymur vəfat etdikdən sonra varisləri arasında hakimiyyət uğrunda mübarizə başladı. Bu mübarizədə oğlu Şahrux qalib gəldi. Şahrux paytaxtı Herat şəhərinə köçürdü və Azərbaycan Qaraqoyunlu dövlətini asılı hala saldı. Osmanlı və Qızıl Ordu dövlətləri ilə də normal münasibətlər quruldu. Şahruxun ölümündən sonra hakimiyyətə oğlu Uluqbəy gəldi. O, məşhur astronom idi və dövlətin mədəni həyatına daha çox fikir verirdi. Osmanlı dövləti ilə münasibətlərdə də mədəni əlaqələr üstünlük təşkil edirdi. Ancaq siyasi bacarığı zəif olduğundan uzun müddət hakimiyyətdə qala bilmədi. Bu dövrdə Mərkəzi Asiyada yeni bir dövlət – Şeybani dövləti yaranmışdı. Şeybanilər Teymuri dövlətində olan daxili çəkişmələrdən istifadə edib bir sıra əraziləri, xüsusilə Buxara və Səmərqənd şəhərlərini ələ keçirdi. Şeybani işğalları nəticəsində Teymuri dövlətinin ərazisi yalnız Xorasanla məhdudlaşdı.

Teymurilərin sonuncu güclü hökmdarı Hüseyn Bayqara hakimiyyətə gəldikdən sonra itirilmiş torpaqlar geri qaytarıldı, dövlətin nüfuzu bərpa olundu.

Lakin onun ölümündən sonra Şeybanilər yenidən teymurilərə qarşı mübarizəni gücləndirdi. **1507-ci ildə** səfəvilərin himayə etdiyi Teymuri hökmdarı taxtdan salındı və Xorasan ələ keçirildi.

Bununla da **Teymuri dövlətinin varlığına son qoyuldu.** Ancaq şeybanilərin Xorasanı ələ keçirməsi Səfəvi-Şeybani qarşıdurmasının əsasını qoydu.



**Şahruxun xarici siyasətini atasının siyasəti ilə müqayisə edin.**



Sultan Şahrux hakimiyyətdə olduğu müddətdə atası Əmir Teymurdan fərqli olaraq savaş və fəthlərə önəm verməmiş, daha çox elmin və mədəniyyətin inkişafı ilə yanaşı, quruculuq işləri ilə məşğul olmuşdur. O, ayrı-ayrı ölkələrlə, o cümlədən də Çinlə ticarət işlərini genişləndirmiş, imperatorluğu "Teymurlu intibahı" deyilən hərəkatın ən yüksək nöqtəsinə çatdırmağa nail olmuşdu. Şahruxun dövründə paytaxt Herat və Səmərqənd şəhərləri dünyanın ən önəmli mədəniyyət mərkəzlərindən olmuş, dövlətin əvvəlki qüdrəti yenidən canlanmışdı.

Teymuri dövləti
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ
OSMANLI DÖVLƏTİ
Səmərqənd
Təbriz
Herat
TEYMURİ DÖVLƏTİ
İRAN KÖRFƏZİ
QIRMIZI DƏNİZ

# 16 XAÇLI YÜRÜŞLƏRİ

**Səlib, katolik, indulgensiya, Qüds krallığı, Səlahəddin Əyyubi, Qranada əmirliyi**

Avropa xristianlarının şərq-müsəlman ölkələrinə qarşı apardıqları Səlib* yürüşləri dünya tarixində böyük təsir gücünə, mühüm nəticələrə səbəb olmuşdur.

Xristian-katolik kilsəsinin başçılığı altında aparılan bu yürüşlər amansızlıq və qəddarlığı ilə yadda qalmışdı.

*** Səlib**

*ərəb sözü olub mənası "xaç" deməkdir.*

## İmperiyanın daxili siyasəti

IV yüzillikdə Roma imperiyasının parçalanması xristian kilsəsinə də təsir göstərdi. Qərbi Avropada xristian kilsəsinin başçısı Roma papası, Şərq (Bizans) kilsəsində isə Patriarx* sayılırdı.

Qərbi Roma imperiyasının xarabalıqları üzərində öz dövlətlərini quran Avropanın "barbar" başçıları xristianlığı qəbul edərək bu hakimiyyətin İsa peyğəmbər tərəfindən onlara verildiyini iddia etməyə başladılar.

Bütün bunlar Qərbi Avropada xristian dinini möhkəmləndirdi.

*** Patriarx**

*pravoslav kilsəsində ən yüksək ruhani rütbədir.*




**Qərbi Roma imperiyasının yerində yaranmış hansı dövlətin başçısı – kralı xristianlığı qəbul etmişdi?**

Papa və patriarx arasında xristianların vahid lideri olmaq üstündə mübarizə 1054-cü ildə xristian dini və kilsəsinin rəsmi olaraq bölünməsi ilə nəticələndi.

Qərb kilsəsi katolik (ümumdünya), Şərq isə pravoslav (həqiqi din) kilsəsi adlandı.

Qərbi Avropada feodal dağınıqlığı dövründə vahid, mərkəzləşmiş qaydada idarə




***Xristian dininin parçalanmasına həsr olunmuş şəkil***



olunan yeganə təşkilat katolik kilsəsi idi. Roma şəhəri və ətrafındakı ərazilər Papa vilayəti adlanırdı. Bu ərazini papa öz mülkiyyəti kimi idarə edirdi. Katolik kilsəsi həmçinin ən iri torpaq sahibinə çevrilmişdi.

Avropada becərilən torpaqların 1/3 hissəsi kilsəyə məxsus idi. Bütün Qərbi Avropa əhalisi kilsəyə onda bir vergisi ödəyirdi. Hər bir xristian dini mərasimlər üçün (xaç suyuna salınma, kəbin və s.) kilsəyə pul ödəməli, saysız-hesabsız xristian müqəddəslərinin şərəfinə keçirilən bayramlara öz gəlirindən pay ayırmalı idi.

Papalar özlərini tanrının yer üzərində canişini elan edib istənilən şəxsi bağışlamaq hüququna malik sayaraq indulgensiya* – "cənnət qəbzləri" satışlarını həyata keçirirdilər.

Toplanan sərvətlərin çox hissəsi Romaya göndərilirdi. Papa Avropada ən varlı şəxs idi.

Bir sıra dövlətlərin kralları papadan borc alırdılar. Katolik kilsəsinin sərvət toplamaqda, israfçılıqda, xalqı aldatmaqda tənqid edənlər kilsə tərəfindən təqib olunurdu. Onlar bidətçi, yəni dinindən dönən adlandırılırdı.

Bidətçilər **inkvizisiyaya** – kilsə məhkəməsinə verilir, əmlakları kilsənin xeyrinə müsadirə edilirdi.

Papalar Qərbi Avropa üzərində siyasi hakimiyyətə sahib olmaq uğrunda Almaniya imperatorları ilə mübarizə aparırdılar. Papaların nüfuzu o qədər artmışdı ki, İngiltərə, Polşa və Danimarka kralları özlərini papanın vassalı hesab edirdilər.

*** İndulgensiya**

*günahların bağışlanması haqqında Papa fərmanıdır.*




**Sizcə, indulgensiya satışı doğru idimi?**



*Xaçlı döyüşçüsü*


Qüds (Yerusəlim)



Dünyanın ən qədim şəhərlərindən olan Qüds (Yerusəlim) üç dinin (yəhudilik, xristian, islam) müqəddəs şəhəri sayılır. Xristianların inancına görə İsa peyğəmbər burada dəfn edilmişdir.

Müsəlman dünyasının üçüncü müqəddəs məscidi olan Əl-Əqsa bu şəhərdə yerləşir. Yəhudilər Süleyman məbədinin bu şəhərdə yerləşdiyinə inanır. Sonradan məbəd Roma tərəfindən dağıdılmışdır. Qüds şəhəri VII yüzillikdən Ərəb xilafətinin tərkibində idi. XI  yüzillikdə Səlcuq dövləti Qüdsü öz hakimiyyəti altına almışdı.

Müsəlmanların hakimiyyəti dövründə xristian və yəhudilər şəhərdə sərbəst yaşayır, hərə öz dini ayinlərini azad şəkildə həyata keçirirdi.

# Xaçlı yürüşlərinin səbəbləri və başlanması

Roma papası 1095-ci ildə çıxış edərək bütün xristianları “İsanın qəbri"ni azad etmək, Fələstində “müqəddəs torpaqlar"ı müsəlmanlardan təmizləmək uğrunda yürüşə başlamağa səslədi.

Papanın çıxışını dinləyən feodal-cəngavərlər elə orada yaxalarına xaç vurub yürüşə hazır olduqlarını bildirdilər. Tezliklə papanın çağırışı bütün Avropaya yayıldı. Bu Avropada böyük həyəcana, coşquya səbəb oldu. Hər yerdə yürüşə hazırlıq görülməyə başlanıldı.

Yürüş iştirakçılarının tərkibi və məqsədləri müxtəlif idi. Kəndlilərin yürüşdə əsas məqsədləri feodal istismarından canlarını qurtarmaq, torpağa sahib olmaq idi. Feodallar yeni torpaqlar və kəndlilər əldə edərək Şərq ölkələrini qarət etmək ümidində idilər. Papa müsəlmanları və Şərq xristianlarını katolikləşdirməklə Romanın mövqeyini gücləndirməyə, hakimiyyətini genişləndirib gəlirlərini artırmağa çalışırdı.

1096-cı ildə birinci xaçlı yürüşü başlandı. Yürüşə əvvəlcə kəndlilər başladılar. Pis silahlanmış, hərbi işi bilməyən kəndlilər səlcuqlar tərəfindən darmadağın edildilər. Bunun ardınca yaxşı silahlanmış, döyüş təcrübəsi olan feodallar yürüşə başladılar.

1099-cu ildə Qüdsə daxil olan səlibçi ordusu müsəlman və yəhudi əhaliyə qarşı dəhşətli qırğın törətdi.

Aralıq dənizinin şərq sahilləri boyunca ələ keçirilmiş ərazilərdə səlibçilər öz dövlətlərini yaratdılar. Fələstini idarə edən Qüds krallığı səlibçi dövlətlərin başçısı sayılırdı.


**Xaçlı yürüşlərinin əsil səbəbləri hansılar idi?**

Birinci xaçlı yürüşündə xaçlıların uğur qazanmasının əsas səbəbi Böyük Səlcuq dövlətinin zəifləməsi idi. Qüdsün itirilməsi səlcuqların müsəlman aləmindəki mövqeyinə ağır zərbə vurdu. Məğlubiyyətlə barışmaq istəməyən Səlcuq sultanlıqları və bəylikləri ümumi düşmənə qarşı qüvvələrini birləşdirdilər. Bu, tezliklə öz bəhrəsini verdi. Mosul əmiri xaçlıları məğlub edib bəzi əraziləri azad etdi. Buna cavab olaraq ikinci xaçlı yürüşü başladı. Lakin bu yürüş xaçlıların məğlubiyyəti ilə başa çatdı. Bundan sonra xaçlılar daha ağır zərbə aldılar. Misir hökmdarı Səlahəddin Əyyubi xaçlı ordusunu darmadağın edib Qüdsü azad etdi. Qüdsü geri almaq üçün  Müqəddəs Roma imperatoru, Fransa və İngiltərə krallarının iştirakı ilə təşkil edilən üçüncü xaçlı yürüşü də uğursuzluqla nəticələndi. Dördüncü xaçlı yürüşünə Papa III İnnokenti rəhbərlik edirdi. Əvvəlki yürüşlərdən fərqli





***Roma papasının xaçlılar qarşısında çıxışı***

olaraq bu dəfə dəniz yolu ilə getmək qərara alınmışdı. Bu məqsədlə güclü dəniz donanmasına malik olan Venesiyadan gəmilər kirayə edilmişdi. Venesiya Şərq ölkələri ilə ticarətdə Bizansla rəqabət aparırdı. Katolik kilsəsinin də patriarxla düşmənçiliyi yürüşün istiqamətini Bizansın paytaxtı



***Qüdsün xaçlılar tərəfindən alınması***

olan Konstantinopola yönəltdi. 1204-cü ildə xaçlılar Konstantinopolu hücumla tutaraq qarət etdilər.

Xaçlıların bu şəhər üzərində ağalıqları 50 ildən çox davam etdi. Öz paytaxtlarını qaytarmaq üçün uzun müddət mübarizə aparan bizanslılar, nəhayət, səlibçiləri şəhərdən qova bildilər. Bizans imperiyası yenidən bərpa olunsa da, əvvəlki qüdrət və əzəmətini itirdi.

Şərq ölkələrini istila etmək üçün daha 4 xaçlı yürüşü təşkil edildi. Lakin XIII yüzilliyin sonlarında səlibçilər Şərqdə tutduqları bütün ərazilərdən qovuldular.



**Xaçlı yürüşlərinin qarətçi xarakteri özünü hansı yürüşdə daha qabarıq göstərdi?**





Əsrlər boyu müxtəlif düşmənlərin hücumlarına tab gətirmiş bu şəhər ilk dəfə Avropa xristianları tərəfindən tutuldu. Gözəl saray və binalar, heykəllərlə zəngin olan, Avropanın o dövr üçün ən gözəl kilsəsi sayılan Müqəddəs Sofiya kilsəsinin yerləşdiyi bu şəhərdə yarım milyon insan yaşayırdı.
Həmin dövrdə Qərbi Avropanın ən böyük şəhərlərində 10 min insan var idi. Səlibçilərin əsil siması və məqsədləri burada aşkara çıxdı. Onlar xristian şəhərini talan edib Sofiya kilsəsini murdarlamaqdan belə çəkinmədilər.



**Burada hansı şəhərdən bəhs olunur?**

# Avropada müsəlmanlara qarşı xaçlı yürüşləri

VIII yüzilliyin ortalarından Pireney yarımadasında Kordova xilafəti müstəqil dövlət kimi fəaliyyət göstərirdi.

Orta əsrlər dövründə müsəlman İspaniyası Avropanın mədəni və iqtisadi cəhətdən ən inkişaf etmiş ərazisi idi. Burada müsəlmanlarla yanaşı, xristian və yəhudilər də yaşayırdılar. Xristian və yəhudilərin sərbəst şəkildə öz dini inanclarını, ayinlərini yerinə yetirmələrinə imkan verilirdi. Kordova elm, mədəniyyət, sənətkarlıq və ticarət mərkəzi idi. Burada universitet, mədrəsələr, hər birində on minlərlə əlyazma kitablar saxlanılan kitabxanalar, Şərq üslubunda inşa edilmiş yüzlərlə hamam, gecələr küçələri işıqlandırmaq üçün lampalar var idi. Qərbi Avropadan elmi bilikləri artırmaq, müsəlman alimlərindən dərs almaq, cəbr və astronomiyanı öyrənmək üçün avropalılar Kordovaya gəlirdilər. Avropada indi də istifadə edilən rəqəmlərlə tanışlıq Kordovadan başlamışdı.

Müsəlman memarlığının ən gözəl nümunələri indi də İspaniyada qalmaqdadır. Sevilyada inşa edilən Əl-Kəsar saray-qalası, Qranadada yerləşən Əl-həmbra sarayı müsəlman memarlığının inciləri sırasına daxildir. Kordova xilafətinin ticarət gəmiləri Aralıq dənizi hövzəsində yerləşən İtaliya, Bizans, Abbasi xilafəti, Şimali Afrika ölkələri ilə ticarət əlaqələri saxlayırdı. Ərəblərin İspaniyanı ələ keçirdiyi zamanlardan başlayaraq papalar bütün xristianları və müsəlmanları İspaniyadan qovub çıxarmaq üçün xaçlı yürüşünə çağırırdılar.

Vahid dövlət halında olan Kordova xilafəti bu hücumların qarşısını ala bilirdi. Lakin daxili çəkişmələr nəticəsində Kordova bir neçə müstəqil əmirliklərə parçalandı. Səlibçilər parçalan-

mış, öz aralarında düşmənçilik edən əmirlikləri asanlıqla ələ keçirdilər. Pireney yarımadasında bir-birinin ardınca xristian dövlətləri olan Portuqaliya, Kastiliya, Araqon və Navarra krallıqları meydana gəldi. XIV yüzillikdə müsəlmanların əlində ancaq Qranada əmirliyi qalmışdı. Kastiliya və Araqon dövlətlərinin birləşməsi nəticəsində 1479-cu ildə vahid İspaniya krallığı yarandı. Navarranı Fransa ilə öz aralarında bölüşdürən İspaniya daha da gücləndi. 1492-ci ildə İspaniya krallığının ordusu Qranadanı işğal etdi.

Beləliklə, Pireney yarımadasında yalnız xristian dövlətləri olan Portuqaliya və mərkəzləşdirilmiş İspaniya krallığı qaldı. Xristianlar Pireney yarımadasını tamamilə ələ keçirib ən yaraşıqlı məscidləri kilsəyə çevirdilər.

# Xaçlı yürüşlərinin nəticələri

Qarşısına qoyduğu məqsədlərə çata bilməsə də, xaçlı yürüşləri Qərbi Avropa üçün mühüm nəticələrə gətirib çıxardı. Yürüşlər Avropa xalqlarının dünyagörüşünə və mədəniyyətinə mühüm təsir göstərdi. Aralıq dənizində ticarət inkişaf etdi. Şimali İtaliya şəhərləri (Venesiya, Genuya) Bizans və ərəb tacirlərini sıxışdırıb Aralıq dənizindəki ticarəti öz əllərinə aldı. Avropalılar Şərqdən ipək, dərman, ətir və güzgü istehsalını öyrəndilər. Şərqə yürüşlərdən sonra Avropada yel dəyirmanları meydana gəldi, kənd təsərrüfatı inkişaf etdi. Bir sıra yeni bitkilərin – çəltik, qarabaşaq, limon, ərik, qarpız becərilməsinə başlanıldı.

Onların məişət həyatında da bir sıra yeniliklər meydana gəldi.

Avropalıların ilk dəfə kağız və barıtla tanışlığı da Şərqdə oldu.

Xaçlı yürüşləri siyasi həyata da təsir etdi. Yürüşlərin əsas təşkilatçısı və ilhamvericisi olan katolik kilsəsinin, papaların nüfuzu aşağı düşdü. Bu da kilsənin dövlət işlərinə təsirini azaltdı.

Şərq ölkələri üçün bu yürüşlər müsəlman əhalisinin kütləvi qırğını, şəhərlərin dağılması və mədəniyyətin tənəzzülü ilə nəticələndi.




**Avropada müsəlmanlara qarşı xaçlı yürüşünün başlıca nəticəsi nə oldu?**




**Xaçlı yürüşlərinin nəticələri ilə bağlı sxem hazırlayın.**

XAÇLI YÜRÜŞLƏRİ

İlk xaçlı yürüşü (1096–1099)
İkinci xaçlı yürüşü (1147–1149)
Üçüncü xaçlı yürüşü (1189–1192)
Dördüncü xaçlı yürüşü (1202–1204)

İNGİLTƏRƏ
MÜQƏDDƏS ROMA İMPERİYASI
FRANSA
KORDOVA
ROMA
BİZANS İMPERİYASI
QARA DƏNİZ
XƏZƏR DƏNİZİ
KONSTANTİNOPOL
ARALIQ DƏNİZİ
QÜDS
MİSİR

# 17 İTALİYA

**Şəhərlər ölkəsi, ticarət, kommuna, şəhər-respublikalar, Venesiya**



Avropanın digər ölkələrindən fərqli olaraq İtaliyada klassik feodalizm dövründə mərkəzləşdirilmiş dövlət yaranmadı. İtaliya siyasi və iqtisadi cəhətdən dağınıq ölkə olaraq qalırdı. Buna baxmayaraq, İtaliya şəhərlərinin çoxluğu ilə seçilirdi. Burada 300-dək şəhər var idi. İnkişaf etmiş orta əsrlərdə İtaliya şəhərlər ölkəsi kimi tanınırdı.

## İqtisadi inkişafın xüsusiyyətləri

İtaliyada sənətkarlıq və ticarət mərkəzləri olan iri şəhərlər digər Avropa ölkələrinə nisbətən daha tez, IX–X yüzilliklərdə meydana gəldi. Şəhərlər, bir qayda olaraq, çay və dənizlərin yaxınlığında, ticarət yollarının kəsişdiyi yerlərdə, böyük monastırların və iri feodal qəsrlərinin yaxınlığında, həmçinin qədim Roma qalalarının xarabalıqlarının yerində salınırdı.

Şəhər sakinləri başlıca olaraq sənətkarlıq və ticarətlə məşğul olsalar da, hələ uzun müddət kənd təsərrüfatı ilə əlaqəni üzməmişdilər. Qala divarlarından xaricdə taxıl zəmiləri, bağ və bostanlar yerləşirdi. Otlaqlarda mal-qara sürüləri otlayırdı. Qala divarları ilə əhatə olunmuş şəhərlərin ərazisi kiçik olduğundan burada evləri iki-üç mərtəbəli tikirdilər. Şərq ölkələrindəki şəhərlərlə müqayisədə burada su kəmərləri və kanalizasiyanın yoxluğu nəticəsində natəmizlik baş alıb gedirdi. Şəhərlərdə yeganə





*Florensiya*



geniş yer bazar meydanı idi. Meydanın yanında şəhərin baş kilsəsi yerləşirdi.

Şəhərlərdə istehsal olunan məhsulun əksəriyyəti emalatxanalarda hazırlanırdı. Emalatxana həm də hazır məhsulu satmaq üçün dükan rolunu oynayırdı. Sənətkarlar daha çox satış məqsədli mal-***əmtəə*** istehsal edirdilər. Onlar bu məhsulları şəhərdə fəaliyyət göstərən tacirlərlə yanaşı, uzaq yerlərdən gələnlərə də satırdılar. Ticarət şəhərlilərə böyük gəlir gətirirdi.



***Qızıl pul (İtaliya)***





**Sizcə, şəhərlərin sürətli inkişafının əsas səbəbləri hansılar idi?**

Əvvəllər Şərqlə Qərb arasındakı ticarət əlaqələrində başlıca yeri Bizans tuturdu. Sonralar Aralıq dənizi vasitəsilə Şərq ölkələri ilə ticarət Venesiya və Genuya tacirlərinin əlinə keçdi. Onların ticarət əlaqəsi saxladığı Şərq ölkələrindən biri də Azərbaycan idi.

Şəhərlərin salındığı torpaqlar, adətən, feodallara məxsus olurdu. Onlar şəhər əhalisinin senyoru hesab edilirdi. Buna görə də onlar şəhərlilərdən vergi alırdı. Şəhərlər varlandıqca, senyorlar da verginin miqdarını artırırdılar. Şəhərlərin bütün iqtisadi və siyasi həyatı



***Florensiya sərrafları***

senyorların nəzarəti altında idi. Demək olar ki, bütün Avropa ölkələrində şəhərlilər senyorların zülmündən xilas olmaq üçün mübarizəyə qalxırdılar. İtaliyanın bir sıra şəhərləri senyorlara qarşı mübarizədə qalib gəlib özünüidarə hüququ aldı. Belə şəhərlər kommuna adlanırdı. Azad kommunalar tədricən ətraf əraziləri də öz tərkiblərinə daxil edərək müstəqil şəhər-dövlətlərə və ya ***şəhər-respublikalara*** çevrildi.



**Orta əsrlər İtaliya şəhərləri ilə Azərbaycan şəhərlərini müqayisə edin.**



# Şəhər-respublikalar

İtaliyada mövcud olan şəhər-respublikaların öz qanunvericiliyi, inzibati idarəsi, qoşunu var idi. Onlar pul zərb etmək və gömrük yığmaq hüququna malik idi.

XI–XV yüzilliklərdə ***Florensiya*** İtaliyanın iqtisadi cəhətdən inkişaf etmiş ən iri şəhər-dövlətlərindən biri idi. Şəhərdə çoxlu sayda iri mahud emalatxanaları var idi. Burada muzdlu əmək tətbiq olunurdu. Şəhərin varlı ailələri arasında hakimiyyət uğrunda mübarizə gedirdi. Nəticədə Mediçi ailəsi qalib gəldi. Onların sırasında varlı bankirlər və tacirlər var idi. Mediçilərin hakimiyyəti zamanı Florensiya daha da inkişaf etdi.



**Hakimiyyətin ayrı-ayrı ailələrin əlinə keçməsi idarəçilikdə hansı dəyişikliklərə səbəb ola bilərdi?**

XIV yüzilliyin ortalarında ***Venesiya Respublikası*** Avropanın ən qüdrətli dəniz dövlətlərindən birinə çevrilmişdi. Xaçlı müharibələrindən istifadə edən Venesiya Egey dənizi hövzəsində və Konstantinopolda ticarət məntəqələri ələ keçirmişdi.

Venesiya vasitəçi ticarətdən çox böyük gəlir götürürdü. Çindən, Hindistandan, Azərbaycandan, eləcə də Yaxın və Orta Şərq ölkələrindən gətirilən müxtəlif mallar Venesiya tacirləri vasitəsilə Avropa ölkələrinə çatdırılırdı.



**Venesiyanın coğrafi mövqeyi Aralıq dənizindəki ticarət üstünlüyünə necə təsir göstərirdi?**

*Venesiya*




Şərq ölkələri ilə ticarət əlaqələrində Venesiyanın Qara dənizdəki ticarət mərkəzləri əhəmiyyətli rol oynayırdı. Azərbaycanda istehsal olunan xam ipək Venesiya və Genuya tacirlərinin əsas hədəfində idi. Bu dövlətlərin tacirləri öz ölkələrindəki toxuculuq müəssisələrinin tələbatını Azərbaycandan aldıqları xam ipəyin hesabına ödəməyə çalışırdılar. Genuya Respublikasını vasitəçilikdən sıxışdırıb çıxardan Venesiya Şərqlə ticarərətdə tam üstünlüyə nail oldu. Venesiyanın Aralıq dənizi ticarətindəki üstün mövqeyi osmanlıların Konstantinopolu ələ keçirmələrinədək davam etdi.

Şərqlə vasitəçi ticarətdən külli miqdarda gəlir əldə edən tacirlər ayrı-ayrı şəxslərə faizlə borc pul verir, nəticədə daha da varlanırdılar. Təsadüfü deyil ki, Avropada yaradılan ilk bank da hələ XII yüzillikdə Venesiyada fəaliyyətə başlamışdı. Burada elə o vaxtdan ***veksel**** və ***çek sistemi**** tətbiq olunurdu.



*Venesiya şəhəri*

Şərqlə ticarət Venesiyada toxuculuq müəssisələrinin inkişafına təkan verirdi. Əl əməyinə əsaslanan, əmək bölgüsü və muzdlu əmək tətbiq olunan belə kiçik müəssisələr manufaktura adlanırdı. Müxtəlif ölkələrdən, xüsusilə Azərbaycandan gətirilən xam ipək, pambıq və yun burada toxunurdu. İstehsal olunan məhsul Avropa dövlətlərinə baha qiymətə satılır və yüksək mənfəət əldə olunurdu. Venesiya güzgüləri Azərbaycanla yanaşı, bir çox ölkələrdə şöhrət qazanmışdı.

*** Veksel**

*pul götürən şəxsin yazılı öhdəlik sənədidir.*

*** Çek sistemi**

*qiymətli kağızların tətbiqi sistemidir.*



**Başqasından faizlə pul götürülməsinin insanların həyatlarında hansı dəyişikliklərə səbəb ola biləcəyini müzakirə edin və nəticə çıxardın.**

# 18 FRANSA

**Mərkəzləşdirilmiş dövlət, Paris, IV Gözəl Filipp, Baş ştatlar, Yüzillik müharibə, Janna d'Ark, Puatye döyüşü, Azenkur döyüşü, Jaklar üsyanı, XI Lüdoviq**

Fransada kənd təsərrüfatı XI yüzillikdən başlayaraq inkişaf etməyə başladı. Yeni qoşqu sistemi nəticəsində atdan istifadə əkin və başqa kənd təsərrüfatı işlərinin müddətini azaltdı. Əmək məhsuldarlığı kənd təsərrüfatında xüsusilə artmışdı. Kəndlilər öz istifadəsində olan torpaq payında daha səylə çalışırdılar.

Feodallara kəndlidən aldığı vergilər biyardan daha sərfəli idi. Aramsız daxili və xarici müharibələr bu dövrdə feodalların təsərrüfatla məşğul olmasını məhdudlaşdırdığından onlar tədricən öz əkin sahələrini istifadə üçün kəndlilərə paylamağa başladılar.

Fransanın şimalından fərqli olaraq cənubunda feodal münasibətləri zəif inkişaf etmişdi. Bunun səbəbi şəhərlərin inkişafı və dağlıq bölgələrdə azad icmaların qalması idi. Buradakı feodallar, demək olar ki, müstəqil idilər.

Fransanın şimalı ilə cənubu arasında sosial-iqtisadi və siyasi inkişaf fərqləri ölkədə vahid xalqın formalaşmasına mane olurdu. Burada yaşayan əhali fərqli dillərdə danışırdı. Bu feodal dağınıqlığını daha da gücləndirirdi.



*Taxıl biçini*

Sənətkarlığın kənd təsərrüfatından ayrılması nəticəsində X yüzillikdə Avropada bir sıra şəhərlər yarandı. Roma imperiyası dövründə salınmış şəhərlər bərpa edildi və yeni şəhərlərin əsası qoyuldu. İlk dövrdə kənd təsərrüfatında çalışan əhali tədricən sənətkarlıq və ticarətlə məşğul olmağa başladı.

Fransanın cənubu və şimalındakı şəhərlərin inkişafı da fərqli idi. Ölkənin cənubunda şəhərlərin yaranması və inkişafı xarici ticarət əlaqələrinin genişlənməsi ilə bağlı idi. Şimalında isə vilayətlər arasında iqtisadi əlaqələrin yaranması buna səbəb olmuşdu.

Xaçlı yürüşləri və Şərq ölkələri ilə ticarət əlaqələri üçün



əlverişli mövqedə yerləşməsi, Cənubi Fransada şəhərlərin inkişafına təsir göstərmişdi. Həmçinin Şərq ölkələri ilə geniş ticarət əlaqələri olan İtaliya və İspaniya ilə yaxınlıq da buna şərait yaratmışdı. Məhz ticarət əlaqələri Fransanın cənub şəhərlərində sənətkarlığın inkişafını sürətləndirirdi.

Fransanın şimal hissəsində isə vilayətlər arasında iqtisadi əlaqələr daha tez yaranmağa başladı. Bu əlaqələrin əsasında şəhərlərdə sənətkarlıq üçün zəruri olan xammal və kənd təsərrüfatı məhsullarının mübadiləsi dayanırdı. Hər bir vilayətin müxtəlif məhsulların istehsalı üzrə ixtisaslaşması onları iqtisadi baxımdan bir-birinə bağlayır və iqtisadi birlik inkişaf edirdi.

XIII yüzilliyin sonunda **Paris** bütün Şimali Fransanın ən böyük iqtisadi mərkəzi oldu. Bu, Fransanın siyasi birləşdirilməsinə təsir göstərən amillərdən biri oldu. Şimali Fransa şəhərləri daxili bazarın formalaşmasında fəal rol oynadıqları üçün ölkənin siyasi cəhətdən birləşdirilməsində maraqlı idi. Ona görə də XIII yüzillikdə bu şəhərlər kral hakimiyyətini müdafiə edirdi.



**Fransanın şimalı və cənubu arasında sosial-iqtisadi və siyasi inkişaf fərqlərini təhlil edin.**



**Coğrafi mövqe və təbii amillər sosial-iqtisadi inkişafa necə təsir göstərə bilər?**

***Paris***



# Mərkəzləşdirilmiş dövlətin yaranmağa başlaması

XI–XIII yüzilliklərdə Fransada şəhərlər inkişaf etdi və vilayətlər arasında iqtisadi əlaqələr genişləndi. Nəticədə feodal dağınıqlığının aradan qaldırılması üçün şərait yarandı.

XII yüzillikdən Fransada mərkəzləşdirmə siyasəti əvvəlcə ölkənin şimalından başlandı. Kral hakimiyyəti feodal özbaşınalığına qarşı mübarizə aparır, şəhərlərin, sənətkarlıq və ticarətin inkişafına şərait yaradırdı. Ona görə də şəhərlər kral hakimiyyətini müdafiə edirdi. **Mərkəzləşdirilmiş dövlətin** yaranmasına ən böyük maneə iri feodallar idi. Aralarındakı aramsız mübarizələr feodalların zəifləməsinə və kral hakimiyyətinin güclənməsinə şərait yaradırdı.

XIII yüzilliyin əvvəllərindən ölkənin cənub ərazilərinin də kral hakimiyyəti altında birləşdirilməsi başlandı. Tezliklə Tuluza qraflığı birləşdirildi.

Tuluza qraflığının birləşdirilməsi İngiltərə işğalı altında olan Fransanın cənub-qərb hissəsinin azad edilməsinə şərait yaratdı. Artıq Fransa ərazisinin kiçik hissəsi İngiltərə işğalı altında idi.

Krala tabe ərazilərin genişlənməsi onların mərkəzdən idarə olunmasını zəruri edirdi. Bu ərazilər kral tərəfindən təyin edilən məmurlar tərəfindən idarə olunurdu.

Hakimiyyətin güclənməsi üçün bir sıra islahatlar aparıldı. Kral məhkəməsi mərkəzi hakimiyyətə tabe olan bütün ərazilərdə ali məhkəməyə çevrildi. Mərkəzi hakimiyyətlə yerli hakimiyyət orqanları arasında əlaqə yaratmaq məqsədilə xüsusi kral müfəttişləri təyin edildi. Kral torpaqlarında vahid pul sistemi tətbiq edildi. Ölkənin hər yerində yerli pullarla yanaşı, kralın pul vahidi də qəbul olunmalı idi. Bu, Fransanın iqtisadi cəhətdən birləşdirilməsinə kömək etdi. Kral pulları tədricən yerli pulları sıxışdırıb çıxardı.

XIV yüzilliyin əvvəllərində şəhərlərdə sənətkarlıq və ticarətin inkişafı kənd təsərrüfatında da əmtəə-pul münasibətlərinin genişlənməsinə səbəb oldu. Bu dövrdə kralın mülkləri ölkənin çox hissəsini əhatə edirdi.

**IV Gözəl Filipp** siyasi cəhətdən formal olaraq Fransa krallığından asılı olan və zəngin şəhərləri ilə tanınan Flandriyanı birləşdirməyə cəhd göstərdi. Lakin burada üsyan baş verdi. Hərbi əməliyyatlar nəticəsində IV Filipp yalnız bir neçə şəhəri əldə saxlaya bildi. Aramsız müharibələr çoxlu pul tələb etdiyindən kral vergiləri artırmışdı. IV Filippin kilsə torpaqlarına da vergilər qoyması Roma papası ilə münaqişəyə səbəb oldu. O, Papaya qarşı mübarizədə ölkənin bütün təbəqələrinin dəstəyini qazanmaq üçün 1302-ci ildə **Baş ştatlar** adlanan məclis çağırdı. Bu mübarizədə qalib gələn Fransa kralı Roma papalarını özündən asılı vəziyyətə saldı. Papaların Avropada siyasi və dövlətlərarası münasibətlərdə nüfuzu sarsıldı.



*IV Filipp*

# Yüzillik müharibə

XIV yüzilliyin 30-cu illərində İngiltərə ilə başlayan Yüzillik müharibə Fransada iqtisadi inkişaf və təsərrüfatı tənəzzülə uğratdı, əhalinin sayı azaldı. Ölkənin böyük hissəsi uzun müddət İngiltərə işğalına məruz qaldı.

Yüzillik müharibənin səbəbləri İngiltərə kralının hakimiyyəti altında olan cənub-qərbi Fransa əraziləri, Flandriya uğrunda rəqabət idi. İngiltərə kralının Fransa taxtına iddiası müharibənin başlanması üçün bəhanə oldu. 1337-ci ildə İngiltərə Fransaya qarşı müharibəyə başladı.



**Yüzillik müharibə başlayan dövrdə Azərbaycanda siyasi vəziyyət necə idi?**

Müharibənin əvvəlində ingilis qoşunu həm dənizdə, həm də quruda bir sıra qələbələr qazandı. 1356-cı ildə **Puatye döyüşündə** Fransa ordusu sayca çox olsa da, vahid komandanlıq yox idi. Oxçuların və atlı qoşunun fəaliyyətlərinin doğru əlaqələndirilməsi nəticəsində ingilis ordusu qalib gəldi. Fransa kralı əsir düşdü.



*Puatye döyüşü. Orta əsr miniatürü*



**Sizcə, miniatürdə təsvir edilənlərdən hansı ingilis ordusudur? Mülahizələrinizi mətn əsasında əsaslandırın.**

| İngilis qoşunları | Fransız qoşunları |
|---|---|
| • Sayca çox olmasa da, daha yaxşı təşkil olunmuşdu.<br>• O dövrdə öz bacarıqları ilə məşhur olan ingilis oxçuları atlı qoşunun əməliyyatlarını dəstəkləyirdilər.<br>• Ayrı-ayrı qoşun növləri döyüşlərdə bir-biri ilə yaxşı əlaqələndirilirdi.<br>• Bütün hərbi qüvvələr baş komandana tabe idi. | • Əsasən, atlı cəngavər dəstələrindən ibarət idi.<br>• Oxçular az idi. Cəngavərlər öz hərəkətlərini onlarla əlaqələndirmək istəmirdilər.<br>• Ordu ayrı-ayrı iri feodalların dəstələrinə parçalanmışdı.<br>• Kral yalnız öz xüsusi dəstəsinə, yəni qoşunun bir hissəsinə komandanlıq edirdi. |



**Cədvələ əsasən İngiltərə və Fransa qoşunlarının oxşar və fərqli cəhətlərini müəyyən edin.**

1360-cı ildə Fransanın yeni kralı İngiltərə ilə ağır şərtlərlə sülh bağladı. Onun məqsədi vaxt qazanmaq və qüvvələri yenidən təşkil etmək idi.

Bu dövrdə yeni meydana gələn toplardan istifadə genişləndirildi, qoşunun sayı və kral qoşununun baş komandanının səlahiyyətləri artırıldı.

1415-ci ildə ingilis ordusu yeni qüvvə ilə hücuma keçdi və **Azenkur döyüşündə** qalib gəldi. Fransanın şimalı ingilislər tərəfindən tutulsa da, xalqın müqaviməti onların qəti qələbəsinə mane oldu. İşğal edilmiş ərazilərdə xalq partizan müharibəsi aparırdı.

İngilislər mühüm əhəmiyyət daşıyan Orleanı mühasirəyə aldı. Qalanın alınması Fransa qoşununun şimaldan və cənubdan mühasirəyə düşməsi ilə nəticələnə bilərdi.



*Azenkur döyüşü*

Fransanın taleyi həll olunarkən kəndli qızı **Janna d´Ark** müharibənin gedişində dönüş yarada bildi. Gənc qızın hərbi taktikanı mənimsəməsi, döyüşçülərə vətənin müdafiəçisi kimi baxması, təhlükəli yerlərdə ən öndə olması onlarda ruh yüksəkliyi və inam yaradırdı. 1429-cu ildə Orlean ətrafında qələbə fransızlar üçün ardıcıl məğlubiyyətlərdən sonra ilk böyük qələbə idi. Jannanın xalq arasındakı nüfuzu kral və feodalları narahat edirdi. Bir qədər sonra Janna əsir alındıqda Fransa kralı onun azad edilməsi üçün heç bir addım atmadı. İngilislər Jannanın hərbi uğurlarının əhəmiyyətini azaltmaq üçün onu cadugərlikdə günahlandırıb edam etdilər. Lakin bu edam da ingilislərə kömək etmədi. Yüzillik müharibənin sonuna yaxın Fransa kralı cəngavər və muzdlulardan ibarət daimi qoşun yaratdı.

Müharibə **1453-cü ildə** bağlanan sülhlə başa çatdı. Fransa torpaqları azad edildi. Yalnız Kale limanı ingilislərdə qaldı.



# Jaklar üsyanı

Puatye döyüşündəki uğursuzluq Fransanın bir çox ərazilərində xalqın qəzəbinə və üsyanlara səbəb oldu. **1358-ci ildə** Fransada ən böyük kəndli üsyanı baş verdi. O dövrdə zadəganlar tərəfindən kəndlilərə Jak ləqəbi verildiyinə görə üsyançılar **jaklar** adlandırılırdı. Yüzillik müharibə nəticəsində kəndlilərin vəziyyətinin daha da ağırlaşması və vergilərin artması üsyanın səbəbləri idi. Bəzi şəhərlər üsyançıların tərəfinə keçdi. Kəndlilər feodalların zülmündən kralın xəbərinin olmadığını düşünür, feodallara qarşı "xeyirxah kral" uğrunda çıxış edirdilər. Feodallar danışıqlara dəvət edərək hiylə ilə üsyan başçısını ələ keçirdilər. Üsyan yatırıldı, lakin qorxuya düşmüş feodallar uzun müddət vergiləri artırmağa cəsarət etmədilər.



**Jaklar üsyanının nəticələri nə oldu?**

***Jaklar üsyanının yatırılması***



# Mərkəzləşdirilmiş dövlətin yaranmasının başa çatması

Yüzillik müharibədən sonra yarımçıq qalmış mərkəzləşdirilmiş dövlətin yaradılması prosesi davam etdirildi.

Bu, **XI Lüdoviqin** hakimiyyəti dövründə həlledici mərhələyə daxil oldu. Dövləti idarə edə bilmək üçün XI Lüdoviq düşmənlərinə qarşı mübarizədə hiylədən istifadə etdi. O, rəqiblərini bir-birinə qarşı mübarizəyə sövq etməklə onların birliyinə mane oldu və hər birini ayrı-ayrılıqda məğlub etdi.

Beləliklə, XV yüzilliyin sonlarında Fransanın vahid dövlət halında birləşdirilməsi, əsasən, başa çatdı. Artıq ölkə bir mərkəzdən – kral tərəfindən idarə olunurdu. Bu, **mərkəzləşdirilmiş dövlətin** yaranması demək idi. Mərkəzləşdirilmiş dövlətin yaranması **mütləq monarxiyanın** (kralın təkbaşına hakimiyyətinin) təşəkkülü prosesinə şərait yaratdı.



**Xəritə əsasında XI–XV yüzilliklərdə Fransada baş vermiş geosiyasi dəyişiklikləri təhlil edin.**

## İNGİLTƏRƏ VƏ FRANSA XI–XIV YÜZİLLİYİN ƏVVƏLLƏRİNDƏ


Vilhelm tərəfindən 1066-cı ildə İngiltərənin tutulması


Norman ordularına qarşı yerli əhalinin silahlı qarşıdurma yaratdığı ərazilər


XII yüzilliyin əvvəllərində fransız kralının hakim olduğu ərazilər


XIV yüzilliyin əvvəllərində kral torpaqlarına birləşən ərazilər


İri feodalların malik olduqları ərazilər

İngiltərənin Fransadakı əraziləri


XII yüzilliyin sonları


XIV yüzilliyin əvvəllərində


XIV yüzilliyin əvvəllərində iri feodal ərazilərinin sərhədləri

# 19 İNGİLTƏRƏ

**Hastinqs döyüşü, Norman işğalı, parlament, Uot Tayler üsyanı, Al qızılgül və Ağ qızılgül müharibəsi**

İngiltərənin bir hissəsini IX yüzillikdən istila edən vikinqlər və daha əvvəllər burada krallıq quran anql-sakslar tədricən qaynayıb-qarışaraq ingilislər adlandırıldı. İngiltərədə feodallaşma prosesi XI yüzilliyin ikinci yarısında Normandiya istilası ilə başa çatdı.

Fransanın şimal-qərbində yerləşən Normandiyanın hersoqu **Vilhelmin** İngiltərə taxtına olan iddiası bu ölkəyə yürüş üçün bəhanə oldu. Bu iddianın əsasında onun ölmüş İngiltərə kralı ilə qohumluğu dayanırdı. 1066-cı ildə **Hastinqsdə** Vilhelm və İngiltərə kralının qoşunları üz-üzə gəldi. Döyüş norman oxçularının hücumu ilə başladı, lakin çox da uğurlu olmadı. Çünki anql-saksların geniş qalxanları onları ox atışlarından qorudu. Normanların piyada və süvarilərlə sonrakı hücumu da dəf edildi. Hücumlardan nəticə əldə edə bilməyən normanlar hiylə işlədərək geri çəkildilər.



**Sizcə, miniatürdə təsvir edilənlərdən hansı ingilis ordusudur? Mülahizələrinizi mətndən istifadə etməklə əsaslandırın.**



Normanların gəlişindən əvvəl ingilislər kiçik kəndlərdə yaşayırdılar. Hər bir ailə özünə məxsus olan kiçik torpaq payını əkib-becərirdi. Hər bir ailənin qoyun, inək və donuzlarını otardıqları ortaq torpaq deyilən böyük və açıq ərazisi var idi. Hər bir kəndin qanunlara əməl edilməsinə nəzarət edən bir şerifi, yəni polisi var idi. İngilis kəndliləri müharibə zamanı kralın komandanlığı ilə işğalçılara qarşı vuruşurdular.



**Mənbə əsasında norman işğalı ərəfəsində İngiltərədə sosial-iqtisadi vəziyyəti dəyərləndirin. Mövzunu öyrəndikdən sonra norman işğalından əvvəl və sonrakı dövrü müqayisə edin.**



*Hastinqs döyüşü. Orta əsr miniatürü*






**T** **Sxem əsasında Hastinqs döyüşünün gedişini təhlil edin.**

Anql-sakslar hücuma keçərək güclü müdafiə xətlərini yardılar. Norman ordusu geri döndü və sürətlə hərəkət edən atlı qoşun dağılmış durumda olan anql-saks piyadalarını məğlub etdi.

Vilhelm Londona daxil olub özünü İngiltərə kralı elan etdi. Bütün ölkə ərazisi yeni İngiltərə kralının mülkü elan edildi və istilaçılara paylandı. Kəndlilər, əsasən, təhkimli vəziyyətinə salındılar. Mülki idarəçilik və ali kilsə vəzifələrində də yerliləri normanlar əvəz etdi. Beləliklə, işğal nəticəsində hakim təbəqə bütünlüklə dəyişdi. Bütün əkilən torpaqların yeddidə biri, şəhərlərin çoxu kralın mülkü oldu. Ən böyük torpaq sahibi olması və işğal edilmiş ərazilərin bir hissəsini vassallarına paylaması bu dövrdə İngiltərədə kral hakimiyyətini qüvvətli edən şərtlərdən idi.



**XI yüzillikdə Fransadan fərqli olaraq İngiltərənin hansı sosial-iqtisadi və siyasi xüsusiyyətləri var idi?**

***I Vilhelm***





*London orta əsrlərdə*

İngiltərədə işğaldan sonra azad kəndlilər az da olsa, qalırdı. Təhkimlilərlə yanaşı, azad kəndlilərin olması orta əsrlərdə İngiltərədə aqrar inkişafın xüsusiyyətlərindən biri idi. Şəhərlər hələ norman işğalından əvvəl, X–XI yüzilliklərdə yaranmağa başlamışdı. İşğaldan sonra İngiltərənin xarici ticarət əlaqələri genişləndi. Şəhərlərin inkişafının əsasını, digər ölkələrdə olduğu kimi, sənətkarlıq və ticarət təşkil edirdi.

Məlum olduğu kimi, İngiltərədə şəhərlərin əksəriyyəti kralın mülkündə yerləşirdi. Ona görə də Fransadan fərqli olaraq

| Norman işğalının İngiltərə üçün nəticələri |
| --- |
| **Siyasi nəticələr** |
| • Kral hakimiyyəti gücləndi.<br>• Ölkənin siyasi birliyi möhkəmləndi.<br>• Mərkəzləşdirilmiş dövlətin əsası qoyuldu. |
| **Sosial-iqtisadi nəticələr** |
| • Feodallaşma prosesi başa çatdı.<br>• Kəndlilər, əsasən, təhkimli vəziyyətinə düşdü.<br>• Daxili və xarici ticarət genişləndi. |



Dövlətin mərkəzləşdirilməsində II Henrixin islahatları mühüm rol oynadı. Kral məhkəməsinin səlahiyyətlərini genişləndirmək məqsədilə islahat keçirildi.

İslahata əsasən hər bir azad adam müəyyən ödənc müqabilində kral məhkəməsinə müraciət edə bilərdi. Kral məhkəməsində iş iclasçılar tərəfindən araşdırılırdı. Beləliklə, bütün ölkə üçün **vahid kral məhkəməsi** yaranmağa başladı.

Hərbi islahata əsasən feodallar **"qalxan pulu"** adlı xüsusi vergi verməli idilər. Həmin ödənişin hesabına kral hərbi xidmətə muzdlu cəngavərlər cəlb edirdi.

Bu da kralın baron qoşunlarından asılılığını azaldırdı. Bundan başqa, hər bir azad adam əmlakına uyğun olaraq müəyyən silaha malik olmalı və kralın çağırışı ilə yürüşdə iştirak etməli idi.

Bu islahatlar kral hakimiyyətini gücləndirir və feodal dövlətinin mərkəzləşdirilməsinə kömək edirdi.

XII yüzilliyin sonlarına doğru normanlar və İngiltərənin yerli əhalisinin tədricən qaynayıb-qarışması prosesi başa çatdı və ölkədə dil fərqləri aradan qalxdı.

Əhalinin əsas hissəsinin – kəndlilər, şəhərlilər və feodalların əksəriyyətinin danışıq dili ingilis dili idi. Lakin feodal əyanları, kral məmurları fransız dilindən də istifadə edirdilər.

Dövlət orqanlarında rəsmi dil kimi isə fransız və latın dilindən istifadə edilirdi.

İngiltərədə şəhərlər özünüidarə hüququ qazana bilmədi. Bütün feodallar bilavasitə kralın vassalları idi. Bu baxımdan İngiltərə digər Avropa ölkələrindən fərqlənirdi. Feodallar krala hərbi xidmət etməyə və vergi ödəməyə məcbur idilər. Bu amillər XI–XII yüzilliklərdə digər Avropa ölkələrindən fərqli olaraq İngiltərədə kral hakimiyyətinin daha güclü olmasına təsir göstərdi.

XII yüzilliyin ikinci yarısında İngiltərədə kral hakimiyyəti daha da gücləndi. **II Henrixin** hakimiyyəti dövründə Fransanın bəzi torpaqları da onun tabeliyinə keçdi.



*Kral II Henrix*




**"Qalxan pulu"nun mahiyyəti nədən ibarət idi?**




**II Henrixin islahatları ilə bağlı cədvəli tamamlayın.**

| II Henrixin islahatları | |
|---|---|
| Məhkəmə | |
| Hərbi | |
| Nəticə | |

# Parlamentin yaradılması

**1265-ci ildə** İngiltərə tarixində ilk dəfə olaraq parlament çağırıldı. Parlamentdə iri feodallar, ali ruhanilər, cəngavərlər və şəhərlərin nümayəndələri təmsil olunurdu. Kral vergiləri parlamentlə razılaşdırıb təyin edə bilirdi. XIV yüzillikdə parlament vergi təyin etmək hüququ ilə yanaşı, qanunların verilməsində də iştirak etmək hüququ qazandı.



**Parlament dövlət idarəçiliyində hansı rola malik idi?**

XIV yüzilliyin ortalarında Avropa və İngiltərəni vəba epidemiyası bürüdü. İnsanlar tərəfindən "qara ölüm" adlanan bu epidemiya İngiltərədə əhalinin dörddə birindən çoxunu tələf etdi. Epidemiya başa çatdıqdan sonra işçi qüvvəsinə tələbat artdı. Ona görə də kral torpağı və digər gəlir mənbəyi olmayan 12–60 yaş arasındakı bütün adamları aşağı əməkhaqqı ilə işləməyə məcbur edən qanun qəbul etdi. İmtina edənlər ağır cəzalara məhkum edilirdi.

Bu amansız qanunlar əhalinin narazılığına və üsyanlara səbəb oldu. Məhz bu dövrdə feodal zülmünə qarşı mübarizə aparan məşhur **Robin Qud** haqqında rəvayətlər yarandı.



**Epidemiyaların sosial iqtisadi inkişafa necə təsir göstərdiyini müasir dövrlə əlaqələndirin.**

XIV yüzilliyin ikinci yarısında İngiltərədə kəndlilərin vəziyyəti daha da ağırlaşdı. Yüzillik müharibənin gedişində vergilərin artırılması kəndlilərin narazılığına səbəb oldu.

1381-ci ildə **Uot Taylerin** başçılığı ilə kəndli üsyanı baş verdi. Kəndlilər kralla görüşmək və vəziyyətlərinin yaxşılaşdırılması üçün tədbirlər görülməsini xahiş etmək məqsədilə Londona yürüş etdilər. Onlar "xeyirxah kral"a inanırdılar. Kralla görüşən kəndlilər təhkimçilik, biyarın ləğvi, vergilərin azaldılması ilə bağlı tələblərini verdilər. Kral əvvəlcə tələblərlə razılaşdı. Lakin sonra hiylə və xəyanətə əl ataraq üsyanı yatıra bildi. Üsyan məğlub olsa da, vergilər bir qədər azaldıldı, az əməkhaqqı ilə işləməyə məcbur edən qanunlar yumşaldıldı. Kəndlilərin təhkimçilikdən azad edilməsi sürətləndi.



**Uot Tayler və Fransadakı jaklar üsyanını müqayisə edin.**

| Uot Tayler üsyanı | | Jaklar üsyanı |
|---|---|---|
| Fərqli cəhət | Oxşar cəhət | Fərqli cəhət |
| | | |

*Uot Tayler üsyanı*



# Al qızılgül və Ağ qızılgül müharibəsi

İngiltərə tarixində **XV yüzilliyin ikinci yarısı** iki feodal qrupu arasında hakimiyyət uğrunda müharibə ilə səciyyəvidir. Bu müharibədə feodal qruplarından birinin bayrağında al rəngli qızılgül, digərində isə ağ qızılgül təsviri var idi. Ona görə də bu müharibə qızılgüllərin

rənginə uyğun olaraq **Al qızılgül və Ağ qızılgül müharibəsi** adlanırdı.

1455–1485-ci illəri əhatə edən müharibə İngiltərədə yeni sülalənin – **Tüdorların** hakimiyyətə gəlməsi ilə başa çatdı. Bu sülalənin banisi olan **VII Henrix** mərkəzi hakimiyyəti möhkəmləndirmək məqsədilə iri feodallara qarşı mübarizə apardı. Beləliklə, İngiltərədə **mütləq monarxiyanın** yaranması prosesi başlandı.

Mərkəzləşdirilmiş feodal dövlətinin yaranması və London mərkəz olmaqla vahid bazarın yaranması ilə İngiltərədə dil fərqləri tədricən aradan qalxdı. Fransız, latın və başqa dillərin təsiri ilə zənginləşən ingilis dili formalaşdı. XV yüzillikdə ingilislərin ərazi və dil birliyi əsasən müəyyənləşdi.


*Al qızılgül və Ağ qızılgül müharibəsi*

# I Yelizaveta

XVI yüzillikdə Tüdorlar sülaləsinin son hökmdarı **I Yelizaveta** müstəmləkələr uğrunda mübarizədə ingilis dəniz quldurlarını və səyyahlarını himayə edirdi. Bu dövrdə dəniz ticarəti və müstəmləkələr uğrunda mübarizədə İngiltərənin əsas rəqibi İspaniya idi. Kraliçanın əmri ilə ingilis dəniz quldurları İspaniyanın Amerikaya səfər edən gəmilərinə hücumlar edirdilər. 1588-ci ildə İspaniyanın "Məğlubedilməz armada" adlanan dəniz donanması məğlub edildi. Bundan sonra dəniz ticarəti və müstəmləkələr uğrunda mübarizədə İngiltərənin mövqeyi gücləndi.

**I Yelizaveta** Şimali Amerikada ingilis koloniyası qurmaq istəyirdi. Ona görə də bura bir neçə səfər təşkil etdirdi. Bu səfərlər nəticəsində Amerikadan İngiltərəyə kartof və tütün gətirildi. Bu bitkilərin İngiltərədə istehsalına başlanıldı.




**İngiltərənin XI–XV yüzilliklər tarixi ilə bağlı zaman oxunu tamamlayın.**

*I Yelizaveta*



1066 — 1265 — 1381 — 1455 — 1485





# 20 REFORMASİYA

**Martin Lüter, Tomas Münser, Auqsburq müqaviləsi, protestantlıq**

Reformasiya latın dilində "yeniləmək" və "nizamlamaq" mənasını verir. Ümumiyyətlə, orta əsrlərdə kilsənin və xristian cəmiyyətinin mövcud vəziyyətinin yenilənməsini bildirən bu söz XVI yüzilliyin birinci rübündə Almaniyadan başlayan və tədricən Avropanın böyük hissəsinə yayılan dini hərəkatı ifadə edir. Bir çox Avropa ölkələrinə, xüsusən də Almaniyaya təsir edən bu hərəkat siyasi, dini, sosial və iqtisadi baxımdan bir çox yeniliklər gətirdi.

Almaniyada reformasiyanın ortaya çıxmasının bir-biri ilə əlaqəli olan siyasi, dini, sosial və iqtisadi səbəbləri var idi.

**Siyasi baxımdan.** Reformasiyadan əvvəl digər Avropa dövlətləri ilə müqayisədə Almaniya siyasi cəhətdən bütöv deyil, dağınıq vəziyyətdə idi. Müqəddəs Roma imperiyasının sərhədləri içərisində qalan Almaniya bəzi Avropa ölkələrindən fərqli olaraq güclü hakimiyyətdən məhrum idi. Dağınıq olan Almaniya ərazisi bir çox varlı ailələrin, çoxsaylı knyazların və hersoqların arasında bölünmüşdü. Bu vəziyyət Almaniyada siyasi hakimiyyət boşluğu və xarici müdaxilələrə şərait yaradırdı.

***Martin Lüter Vittenberq kilsəsində***





**Reformasiyanın Almaniyada başlanmasına şərait yaradan səbəbləri müəyyən edin.**

Digər tərəfdən imperiyanın hakim sülaləsi olan Habsburqlar katolik kilsəsinin diqqətini Almaniyaya yönəltməkdə kömək edirdi. Bu səbəbdən Fransa, İspaniya və İngiltərədə fəaliyyət göstərə bilməyən kilsə Almaniyada istədiyi kimi hərəkət edə bilirdi.



**Almaniyanın dağınıq olmasına səbəb nə idi və bu hansı problemləri yaradırdı?**



**Dini baxımdan.** Reformasiyaya qədərki dövrdə almanların dini həyatı katolik kilsəsinin nəzarəti altında idi. Almaniyadakı siyasi hakimiyyətin zəifliyindən istifadə edən kilsə dini sahədə olan gücünü iqtisadi gəlir mənbəyinə çevirmişdi. Belə ki o, indulgensiya (*cənnət qəbzləri*) satışını Almaniyada əsas gəlir mənbəyinə çevirərək ondan külli miqdarda pul qazanırdı.

**Sosial baxımdan.** XVI yüzillikdə Almaniyada kəndlə müqayisədə şəhərdə yaşayan əhalinin sayı az idi. Əhalinin şəhərdə məskunlaşma səviyyəsi aşağı olduğundan bu, təhsilə də təsirini göstərirdi. Almanların bu dövrdə kəndlərdə yaşaması reformasiyanın başlamasına şərait yaradan amillərdən idi. Almanların özünüdərk prosesində kəndlilərin xüsusilə böyük təsiri olmuşdur. Çünki kəndlilər az təhsilli və ya savadsız olduqlarından latın mədəniyyətinə yad olmuş və almanlılıqlarını şəhərlilərlə müqayisədə daha çox qorumuşlar. Almaniya təkcə siyasi, dini və iqtisadi baxımdan deyil, həm də mədəni cəhətdən də katolik kilsəsinin təsiri altında idi. Kilsə dini ayinlər vasitəsilə latın dilini Almaniyada məcburi dilə çevirməyə səy göstərirdi. Xüsusilə təhsildə latın dilini bilməmək böyük qəbahət hesab edilirdi. Məktəblərdə latın dili dərslərinə hazırlaşmayan və alman dilində danışan şagirdlərə cəza verilirdi. Martin Lüter də belə şagirdlərdən biri olmuş, bu da onun gələcək fəaliyyətinə təsir etmişdir.




**Martin Lüterin burada şagird olması, sizcə, onun gələcək fəaliyyətinə necə təsir göstərmişdir?**



*Protestant islahatçıları*

*Martin Lüterin din xadimləri qarşısında çıxışı*

Alman torpaqları, alman xalqının mədəni həyatı, həm də alman qəhrəmanları haqqında əsərlərin yazılması və onların əhali arasında sürətlə yayılması katolik kilsəsinə qarşı əhalinin mübarizə əzmini artırmışdı.

**İqtisadi baxımdan.** Reformasiya ərəfəsində Almaniya iqtisadi problemlər yaşayırdı. Xarici bazarda İngiltərə, İtaliya və Hollandiyadan geri qalırdı. Daxili bazarda isə inflyasiya artdı, inhisarçılıq və rüşvətxorluq geniş vüsət aldı. Tacirlər imperatora rüşvət verməklə onlara qarşı dövlət müdaxiləsinin qarşısını aldılar.

Bu dövrdə Almaniyada iqtisadiyyat, əsasən, kənd təsərrüfatı və mədənçilik üzərində qurulmuşdu. Almaniya pul ehtiyacını, əsasən, satılan kənd təsərrüfatı məhsulları hesabına ödəyirdi. Mədənlərdən, xüsusilə qızıl mədənlərindən qazanılan gəlirlərin alman iqtisadiyyatına xeyri yox idi.



**Avropada kilsənin nüfuz qazanmasının əsas səbəbləri nə idi?**

Almaniyanın böyük hissəsində katolik kilsəsi daşınmaz əmlaka sahib olaraq xeyli miqdarda vergilər yığırdı. Həmin vergilərin hesabına kilsələr tikilir, türklərlə aparılacaq müharibələr maliyyələşdirilirdi.

Almaniyada reformasiya hərəkatı 1517-ci ildə Martin Lüterin Vittenberqdə 95 maddəlik tezisini kilsə qapılarına asması ilə başladı. Əsasən, indulgensiyaların tənqid edildiyi bu tezislər reformasiyanın proqramına çevrildi.

Lüterin katolik kilsəsinə etirazı qısa müddətdə Roma papasına çatdı. Papa Lüteri Romaya çağırsa da, o getmədi. Çünki bundan əvvəlki çağırışların nəticələrini yaxşı bilirdi. Lüter



***Martin Lüterin Vittenberqdə 95 maddəlik tezisini kilsə qapılarına asması***

Almaniyada böyük nüfuza sahib olan Saksoniya knyazına sığındı. O isə papaların cəhdlərinə baxmayaraq, Lüteri onlara vermədi.

Vormsda keçirilən toplantıda Lüter və onun tərəfdarlarının əleyhinə qərarlar qəbul edildi. Bu qərarlara əsasən Lüterin əsərləri yandırılmalı, tərəfdarları həbs olunmalı idi. Lakin Saksoniya knyazı buna imkan vermədi.

Knyazlardan fərqli olaraq, imperator reformasiyanın Almaniyada yayılmasına qarşı idi. Buna görə də reformasiyanın başqa ərazilərə yayılmaması üçün qərarlar verdi. Bu qərara qarşı bir neçə knyaz və şəhər **protest** (etiraz) etdi. Bu vaxtdan etibarən Lüterin tərəfdarlarına protestant adı verildi.

Lüter və protestantların apardığı mübarizə 1555-ci ildə **Auqsburq** müqaviləsinin imzalanması ilə başa çatdı. Müqaviləyə əsasən protestantların din azadlığı rəsmi olaraq tanındı, protestant knyazlara böyük imtiyazlar verildi.

Reformasiya nəticələri baxımından dini qayda-qanunlar tamamilə olmasa da, əhəmiyyətli dərəcədə dəyişdi. Əvvəl katolik kilsəsinin təsiri altında olan Avropa yeni ortaya çıxmış protestant kilsəsini qəbul etməyə məcbur oldu.




**Reformasiyanın katolik kilsəsi üçün nəticələri nədən ibarət oldu?**

Reformasiya bir çox səbəblərdən uğurla başa çatdı. Bunların arasında iki səbəbin daha çox təsiri oldu.

**1. Siyasi hakimiyyət**. Almaniyada reformasiyanı dəstəkləyən siyasi hakimiyyəti knyazlar təmsil edirdilər.

Belə knyazlardan daha çox fərqlənəni Saksoniya knyazı idi. O, Lüteri, ümumiyyətlə, reformasiyanı katolik kilsəsindən qorudu.

**2. Mətbəə.** Lüterin ideyaları mətbəədə qəzetlər, kitablar halında çap olunaraq alman xalqının istifadəsinə verilmiş və sürətlə yayılmışdır. Roma papalarının latın dilini yaydıqları bir dövrdə bu əsərlər alman dilində yazılırdı və əhalinin istifadəsi üçün rahat idi.




**Reformasiyanın uğur qazanmasında mətbəənin rolunu necə qiymətləndirərdiniz?**

XI yüzillikdə xristianlıq, bu dəfə isə katolik kilsəsi parçalandı. Ayrılmış protestantlar isə artıq papaya tabe deyildi. Katolik kilsəsi həm əmlakının böyük hissəsini, həm də əvvəlki nüfuzunu itirmişdi.

Reformasiya katolik kilsəsinin əsil niyyətlərini ortaya çıxardı. Kütlənin onlardan uzaqlaşdığını görən Papa itirdiklərini geri qaytarmaq üçün hər vasitəyə əl atdı.

İsa cəmiyyəti, Papa məhkəmələrinin yaradılması bu məqsədə xidmət edirdi. Yaradılan orqanlar sərt qaydalarla idarə olunurdu.

Məqsədlərinə çatmaq üçün qırğınlar törədir, onlara qarşı çıxanları tonqalda yandırırdılar. Belə dəhşətli qırğınlardan biri Fransada protestantların kütləvi halda öldürülməsi oldu.


Kəndli müharibəsi

# Almaniyada kəndli müharibəsi

Kəndlilər arasında reformasiya rəhbəri Tomas Münser idi. O, Lüterdən fərqli olaraq feodal qaydalarını, mövcud problemləri silahlı mübarizə yolu ilə həll etməyə çağırırdı. Bunun üçün kəndlilər 1524-cü ildə üsyana qalxdılar.

Şəhər yoxsulları da kəndlilərin tərəfində üsyana qoşulmuşdular. Onlar feodalların əmlaklarını ələ keçirir, qarət edirdilər.

*Tomas Münser*





**Martin Lüter və Tomas Münserin reformasiyaya münasibətlərinin oxşar və fərqli cəhətlərini müəyyən edin.**

Varlı şəhərlilər isə Lüterlə birlikdə feodalların tərəfinə keçib üsyançıları öldürməyə çağırdılar.

Kəndlilər birlikdə deyil, ayrılıqda mübarizə aparır, hərbi işi bilmirdilər. Bir qrup üsyana başlayanda digər qrup geri qayıdırdı.

Üsyançılara qarşı muzdlu ordu yeridildi. Münserin cəhdlərinə baxmayaraq, kəndli üsyanı 1525-ci ildə məğlub oldu. Özü isə əsir götürülərək edam olundu. Kəndli müharibəsi feodal qaydalarına qarşı yönəlmişdi. Feodal qaydalarının ləğvi **burjuaziyanın*** xeyrinə idi. Lakin yenicə yaranan burjuaziya üsyana rəhbərlik edə bilmədi.

Üsyan amansızlıqla yatırıldıqdan sonra kəndlilərə qarşı feodal qaydaları daha da sərtləşdirildi. Şəxsən azad olan kəndlilər isə təhkimli halına salındılar. Feodal dağınıqlığı isə uzun müddət davam etdi.



**Almaniyada kəndli üsyanının məğlub olmasının səbəbləri hansılar idi?**

### * Burjuaziya

*kapitalist cəmiyyətində istehsal alət və vasitələrinin sahibi olan, muzdlu əməyi istifadə etməklə qazanc əldə edən hakim sinifdir.*


XVI–XVII YÜZİLLİKLƏRDƏ QƏRBİ AVROPADA REFORMASİYA VƏ ƏKS-REFORMASİYA
Katolik kilsənin hakim olduğu ərazilər
Protestant kilsələrinin olduğu ərazilər
Lüteran
Kalvinist
Anqlikan
Katoliklər və protestantlar arasında mübarizələrin davam etdiyi ərazilər
XVII yüzilliyin ortalarında katoliklərə qaytarılmış ərazilər
Müqəddəs Roma imperiyasının sərhədləri
ŞİMAL DƏNİZİ
BALTİK DƏNİZİ
İRLANDİYA
İNGİLTƏRƏ
La Manş boğazı
MÜQƏDDƏS ROMA İMPERİYASI
FRANSA
BİSKAY KÖRFƏZİ
OSMANLI İMPERİYASI
İTALİYA
PORTUQALİYA
İSPANİYA
BALEAR DƏNİZİ
TİRREN DƏNİZİ
Cəbəllütariq boğazı
ARALIQ DƏNİZİ

# 21 TEXNİKİ İXTİRALAR. BÖYÜK COĞRAFİ KƏŞFLƏR

**Domna sobaları, müşket, karavella, Xristofor Kolumb, Ameriqo Vespuççi, Magellan, hindu**

Avropada XV–XVI yüzilliklərdə texniki avadanlıqların inkişafında böyük yeniliklər əldə edilmişdi. Su mühərrikləri təkmilləşmiş, yuxarıdan fırladılan çarxlar ixtira olunmuşdu. Aşağıdan fırladılan çarxlardan fərqli olaraq bu çarxlara su yuxarıdan töküldüyü üçün daha sürətlə hərəkət edirdi. Belə çarxlar mədənlərdən daha çox filiz çıxarmağa, kağız istehsalına və metal döyməyə imkan yaradırdı.

Yeni çarxların ixtirası filiz çıxarılmasında məhsuldarlığın artması ilə yanaşı, metal əridilməsini və emalını təkmilləşdirməyi labüd edirdi. Bu, domna (*metal əridən iri sobalar*) sobalarının tikilməsi ilə əlaqədar daş kömürə tələbatı da artırdı. Domna sobalarının tikilməsi nəticəsində daha çox metal əritmək, çuqun, dəmir və polad əldə etmək mümkün oldu.

Çuqun və dəmir istehsalının artması odlu silahların istehsalı üçün şərait yaratdı. XVI yüzillikdə ağır səhra toplarından istifadə olunurdu. Artıq odlu əl silahları: tapançalar, ağır tüfənglər (*muşketlər*) hazırlanmağa başladı. Bu yeniliklərin nəticəsində feodal cəngavər süvarisi öz yerini odlu silahla silahlanmış muzdlu orduya verdi. Feodal qəsrləri də artıq etibarlı sığınacaq deyildi. Top atəşləri ilə bu qəsrlərin qala divarlarını asanlıqla dağıtmaq mümkün idi.

Beləliklə, texnikanın inkişafı feodal qaydalar əsasında formalaşmış iqtisadi və hərbi qüdrəti laxlatdı.

Avropalı dənizçilər uzun müddət qitənin sahillərindən uzağa üzməyə ehtiyat edirdilər. Uzaq səfərlərə çıxmaq çox təhlükəli hesab olunurdu. Onların düzgün xəritələri və istiqaməti müəyyən etmək üçün dəniz cihazları yox idi. Buna görə də gəmilərin harada olmasını yalnız hava açıq olduğu zaman ulduzlara görə müəyyən edirdilər.

Kompasın əldə edilməsi və bir növ dəniz cihazlarının ixtirası dənizçilərin işini asanlaşdırdı. Artıq açıq dənizdə rahatlıqla uzaq sahillərə hərəkət etmək olardı.

XV yüzillikdə xüsusi yelkənli gəmilərin – karavellaların əldə olunması dəniz səyyahlarının uzaqlara yol almasına şərait yaratdı. Əvvəlkilərdən fərqli olan bu gəmilər həm sürətlə hərəkət edir, həm də küləyin istiqamətindən asılı olmayaraq, istənilən tərəfə üzə bilirdi.





**Odlu silahın istehsalı hərb sahəsində hansı yeniliklərə səbəb oldu?**



**XV–XVI yüzillikdə hansı texniki yeniliklər baş verdi?**



Karavella

# Avropalılar Amerikada

Konstantinopolun fəth olunması avropalıların Şərq ölkələri ilə əlaqələrini çətinləşdirdi. Osmanlıların Kiçik Asiya və Suriyadan keçən ənənəvi ticarət yollarına nəzarəti öz əlinə alması avropalı tacirlərin və səyyahların yeni yollar axtarmasına səbəb oldu.

Pul kəsmək üçün qiymətli metalların azlığı da onların Asiya ölkələrinə marağını artırırdı. Qızıl və gümüşdən başqa, Şərqin zərif parçaları və qiymətli ədviyyatları da avropalıların marağına səbəb olurdu. Hindistan isə onları daha çox cəlb edirdi.

Avropalı səyyahlar Yerin kürə şəklində olması ilə bağlı fərziyyələr irəli sürməyə başladılar. Onların düşüncəsinə görə qərbə doğru hərəkət etməklə




Barıt ilk dəfə çinlilər tərəfindən kəşf edilmiş, əyləncələrdə və şənliklərdə istifadə olunmuşdur. Daha sonra türklər tərəfindən mənimsənilmişdir. Xaçlı yürüşləri zamanı avropalılar da ondan istifadə etməyə başladılar. Barıtdan istifadə etməklə odlu silahların istehsalına nail olundu. Nəticədə cəngavər ordusu və feodal qəsrləri əhəmiyyətini itirməyə başladı. Krallar toplardan istifadə edərək tabe olmayan iri feodalların qəsrlərini ələ keçirdilər. Bununla da Avropada feodal dağınıqlığını güclü kral hakimiyyəti əvəz etdi.





Xristofor Kolumb

maneəsiz olaraq Hindistana gedib çıxmaq olardı. Amma dənizçilərin bu qədər uzaq yolu qət edəcək təcrübələri yox idi.

İtalyan əsilli Xristofor Kolumb gəncliyindən bəri bır sıra coğrafi xəritələrlə tanış olmuşdu. O, İspaniyadan qərbə doğru üzməklə Hindistana getməyin mümkünlüyünə İspan kralını inandırmağa çalışdı.



Ameriqo Vespuççi

Nəhayət, razılıq əldə edən Kolumb 1492-ci ildə karavellalarla qərbə tərəf yola düşdü. Uzun müddətdən sonra Kolumbun gəmiləri sahilə çıxdı.

Onlar bu yerlərin Hindistan olduğunu zənn etdikləri üçün gördükləri yerliləri səhvən hindu adlandırdılar. Nəticədə Kuba və Haiti adaları kəşf edilsə də, xəyallarda olan qızıl və digər qiymətli metallara rast gəlinmədi. Bir neçə dəfə yenidən səfərlər təşkil edən Kolumbun sərvət axtarışları nəticəsiz qaldı.

Bir qədər sonra Ameriqo Vespuççi adlı italyan səyyahı Kolumbun kəşf etdiyi yerlərin yeni qitə olduğunu sübut etdi. Buna görə də bu qitəyə onun şərəfinə Amerika adı verildi.



**Amerika qitəsinin kəşf olunmasının əhəmiyyəti nədə idi?**



**Amerika qitəsinin kəşf olunmasına gətirib çıxaran amilləri sadalayın.**

Avropalıların kəşf etdikləri torpaqlara hamıdan əvvəl əsgər, tacir və xristian dini missionerləri* gəlirdi.

*** Missionerlik**

*hər hansı bir dini, onun yayılmadığı ərazilərdə təbliğ etməkdir.*

Tacirlər həmin ərazilərdə talançı yollarla ticarət edir, keşişlər isə yerli əhalini xristianlaşdırmaqla onları itaətdə saxlamaq məqsədi güdürdülər. Xristian dinini qəbul etməyənlər edam olunurdu.

Beləliklə, yeni qitə sakinləri köhnə qitənin talançı və barbar təfəkkürü ilə məhv edilir, əmlakları talanır, özləri isə kütləvi şəkildə qətlə yetirilirdilər. Avropalı işğalçılar Amerika xalqlarının həm özlərini, həm də qədim və zəngin mədəniyyətlərini vəhşicəsinə məhv etdilər.

Yerlilərin – hinduların soyqırımına məruz qalması Amerikada qula ehtiyac yaratdı. Kölə tacirləri Afrikadan buraya qaradərili qullar gətirməyə başladılar.

# Hindistana dəniz yolunun kəşfi

Şərq ölkələrinə yeni yollar axtarmaq məqsədilə Portuqaliya kralları Atlantik okeanına davamlı olaraq gəmilər göndərirdilər. Bu gəmilər Afrikanın qərb sahilləri ilə üzür, yerlilərə şüşə muncuqlar, güzgülər verərək əvəzində qızıl tozu və fil sümüyü alırdılar. Ona görə də Afrikanın sahillərinin bəzi yerləri Qızıl sahil və Fil dişi sahili adlanır.

Burada tədricən qul alveri də başladı. Bartolomey Diaşın başçılıq etdiyi Portuqaliya ekspedisiyası Afrikanın qərb sahilləri ilə üzərək qitənin cənub qurtaracağında Ümid burnunu kəşf edib Hind okeanına çıxdı. Ancaq dənizçilərin yorğunluğu və xəstəliklər səbəbindən Diaşın ekspedisiyası geri qayıtmağa məcbur oldu.

XV yüzilliyin sonlarında ən yaxşı xəritə və karavellalarla təchiz olunmuş yeni ekspedisiyaya portuqaliyalı Vasko da Qama başçılıq etdi. Dörd aydan sonra bu ekspedisiya Ümid burnunu keçib Afrikanın şərq sahillərinə çıxdı. Kəskin isti havadan və fırtınalardan əziyyət çəkən təcrübəli dənizçilər xəstəliklərdən tələf olurdu.

Nəhayət, bir dəniz bələdçisinin köməyi ilə onlar Hind okeanına keçə bildilər. 1498-ci ildə qərb ekspedisiyası Hindistanın Kalikut limanına yanaşdı. Kalikut hakimi ilə baş verən münaqişə qısa çəkdi və Vasko da Qamanın üstünlüyü ilə başa çatdı. Gəmiləri ədviyyatla dolduran avropalılar öz ölkələrinə qayıtdılar. Gəmilərin bir neçəsi batsa da, bu səfər avropalılara böyük qazanc gətirdi. Beləliklə, Hindistana dəniz yolu kəşf olundu.



**Sizcə, Hindistana dəniz yolunun axtarışı avropalılara nə üçün vacib idi?**



Orta əsrlərdə Avropada yazı taxta, daş və gil lövhələr üzərində yazılırdı. Həmin vaxtlarda çinlilər ipəkdən, türklər pambıqdan kağız hazırlaya bilirdilər. O zaman Avropada ipək və pambıq az olduğu üçün kağız baha başa gəlirdi. Daha sonra avropalılar kağız hazırlamağa başladılar.

*Vasko da Qamanın ekspedisiyası*

# İlk dünya səyahəti. Böyük coğrafi kəşflərin nəticələri

İspaniya dənizçiləri Fernando Magellanın başçılığı ilə Xristofor Kolumbun ideyasını təkrarlayaraq 1519-cu ildə dünya səyahətinə başladılar. Onlar Atlantik okeanından keçməklə qərbə doğru hərəkət etmək, Asiyaya çıxmaq istəyirdilər. Cənubi Amerika sahilləri boyunca hərəkət edən ispan dənizçiləri yeni okeana çıxmağı bacardılar. Bir neçə ay ərzində burada heç bir fırtına ilə qarşılaşmayan dənizçilər bu okeanı Sakit okean adlandırdılar. Atlantik okeanından Sakit okeana keçən boğaza isə Magellan adını verdilər. Asiyada Filippin adalarında yerlilərlə toqquşmada Magellan öldürülsə də, qalan dənizçilər 1522-ci ildə İspaniyaya qayıda bildilər.



*Fernando Magellan*

Beləliklə, ilk dünya səyahəti Yerin kürə formasında olduğunu təcrübi cəhətdən qəti sübuta yetirdi. İspan dənizçiləri Avropadan qərbə tərəf üzərək geriyə qayıda bildilər.

Coğrafi kəşflər nəticəsində ticarət yolları dənizlərdən okeanlara keçdi, dünya ticarəti yarandı. Bununla da Şərqin böyük imperiyalarının ərazilərindən keçən ticarət yolları öz əhəmiyyətini itirdi. Venesiya və Genuya bu yollardan kənarda qaldı. Asiya ölkələri ilə ticarət, əsasən, Niderland, İngiltərə və Portuqaliyanın limanlarında cəmləşdi. Dünya ticarətinin genişlənməsi ilə müstəmləkə işğallarına şərait yarandı.

Portuqaliyalılar Ərəbistan və Hindistan yarımadalarının, Şərqi Afrikanın Hind okeanı sahillərində yerləşən şəhərlərini tutdular. Şərqə doğru hərəkət edən portuqaliyalılar Zond və Molukk adalarını tutaraq Çin və Yaponiya sahillərinə qədər gedib çatdılar.

İspaniyalılar Meksikaya daxil olmaqla Braziliyadan başqa,

## Böyük coğrafi kəşflər

ŞİMALİ AMERİKA
ATLANTİK OKEANI
AVROPA
ASİYA
AFRİKA
SAKİT OKEAN
CƏNUBİ AMERİKA
HİND OKEANI
AVSTRALİYA

Fernando Magellanın dünya səyahəti
Ameriqo Vespuççinin səyahəti
Vasko da Qamanın səyahəti
Xristofor Kolombun ilk səyahəti
Bartolomey Diaşın səyahəti

bütün Cənubi Amerikaya sahib oldular. Onlar bütün müstəmləkələrdə yerlilərin – hinduların torpaqlarını əllərindən alıb özlərini qula çevirirdilər.



**İlk dünya səyahəti nəyi sübut etdi?**



**Böyük coğrafi kəşflərin nəticələrini müəyyən edin.**



İşğal edilən torpaqlarda yerli xalqlar böyük sürətlə azalırdı. İspanlar və portuqallar mədənlərdə və plantasiyalarda Afrika mənşəli qaradərili kölələrdən istifadə edirdilər. Onların həyat tərzi çox ağır idi. Yaşamaq üçün şəraiti olmayan, yaxşı qidalanmayan, qadınlarından və uşaqlarından ayrı salınan qullar plantasiyalarda uzun müddət işləyə bilməyib tələf olurdular. Narazılıq edənlər isə ağır işgəncələrə məruz qalırdı.

Qul ticarəti çox sərfəli olduğu üçün bütün gəmilər Afrikadan qaradərili insanları Amerikaya daşıyırdı.




# ŞƏRQ XALQLARININ MƏDƏNİYYƏTİ

**“Nizamiyyə”, astronomiya, Mahmud Kaşğari, Gur Əmir türbəsi, Sinan Xoca**

Ümumdünya mədəniyyətinə bənzərsiz incilər bəxş etmiş türk xalqları əvvəllər yaratmış olduqları möhtəşəm mədəniyyət nümunələrini klassik feodalizm dövründə daha da zənginləşdirdi. Bu dövrdə təhsil və elm inkişaf etdi.

Böyük Səlcuq sultanı Alp Arslan tərəfindən XI yüzilliyin 60-cı illərində Bağdadda açılan “Nizamiyyə” dünyanın ilk mədrəsələrindən biri hesab olunur. Bu ali mədrəsədə dini biliklərlə yanaşı, hüquq, filologiya, riyaziyyat, astronomiya elmləri də tədris edilirdi.

Müsəlman Şərqinin ikinci ali təhsil ocağı XIV yüzilliyin əvvəllərində Təbrizdə yaradılan mədrəsə idi. Teymuri hökmdarı Uluqbəy də ölkədə mədrəsələrin tikilməsinə xüsusi diqqət yetirirdi.


*Uluqbəy*

*“Nizamiyyə” mədrəsəsi*



Osmanlı sultanı I Süleyman Qanuninin hakimiyyəti dövründə təhsil ocaqlarının sayı xeyli artmışdı. Türk dövlətlərində təhsil müəssisələrinin çoxalması elmin inkişafına şərait yaratdı.

Astronomiya sahəsində mühüm nailiyyətlər əldə olunmuşdu. İsfahan rəsədxanasına rəhbərlik etmiş Ömər Xəyyam Səlcuq hökmdarı Məlikşahın şərəfinə "Cəlali təqvimi"ni tərtib etmişdi. Burada o, Miladi təqvimdən daha dəqiq hesablamalar aparmağa nail olmuşdu.

Ulduz bürclərinin dövri adının (ilan, at, qoyun, meymun və s.) türk dilində verilməsi digər türk astronomu Mahmud Kaşğarinin adı ilə bağlıdır.

Uluqbəyin astronomiyanın inkişafında xidmətləri daha çox olmuşdur. O, Səmərqənddə yaratdığı rəsədxanada səma cisimlərinin hərəkətini göstərən cədvəl düzəldərək Ay və Günəşin orbitlərini müəyyənləşdirmişdi.




**Sizcə, dövlət başçılarının elmə və təhsilə diqqət ayırmasının səbəbi nə idi?**



*Ömər Xəyyam*

Coğrafiya elminin inkişafında Çin dənizçilərinin rolu danılmazdır. Çin alimləri Hindistandan Afrikayadək bütün ölkələri öyrənmiş və bu barədə qiymətli tədqiqat əsərləri yazmışlar.

Osmanlı dövlətinin fəthləri artdıqca coğrafiyaya dair biliklər də inkişaf edirdi. Məşhur türk admiralı Piri Rəis bu sahədəki fəaliyyəti ilə daha çox seçilmişdir.

*Piri Rəis*





*Piri Rəisin 1513-cü ildə çəkdiyi dünya xəritəsinin bir parçası*



*Əkbər şaha "Əkbərnamə" kitabının oxunması*



Piri Rəis 1513-cü ildə dünyanın böyük xəritəsini çəkərək Sultan Səlimə təqdim edir. O, sonradan bu sahədə fəaliyyətini davam etdirərək "Bəhriyyə" adlı dəniz atlasını yaradır və bu atlasla Sultan Süleymanı da tanış edir. Piri Rəis dünya xəritəsinə Amerika qitəsini də daxil etmişdi. Bu isə türk səyyah və coğrafiyaşünaslarının Amerika qitəsinin varlığından xəbərdar olduqlarını sübut edir.

Bu dövrdə tibb elminin inkişafına xüsusi diqqət yetirilirdi.

Osmanlı dövlətinin Ədirnə və Azərbaycanın Təbriz şəhərlərində "Darüşşəfa" adlı xəstəxanalar açılmışdı.

Görkəmli alim Fəzlullah Rəşidəddinin tibbə aid əsərləri ona böyük şöhrət qazandırmışdı. İlk "Farmakologiya"* kitabı Çində yazılmış və müxtəlif müalicə üsulları müəyyən olunmuşdu.

*** Farmakologiya**

*dərman məhsullarını araşdıran elmdir.*

Böyük Moğol hökmdarı Əkbər şahın dövründə Hindistan mədəniyyəti daha sürətlə inkişaf etmişdi. Ona görə də bu dövrü "**Əkbər əsri**" adlandırırlar.



*Fəzlullah Rəşidəddinin heykəli*



**Şərq ölkələrində elmin inkişafına təsir göstərən amilləri müəyyən edin.**

# Ədəbiyyat

Dövrün görkəmli türk alimi, ədəbiyyatşünası və folklorçusu Mahmud Kaşğari idi. O, **"Divani lüğət-it-türk"** ("Türk dillərinin divanı") əsərinin müəllifidir. Lüğətdə türk dillərinin zənginliklərini əks etdirən misallar, xalq şeiri nümunələri, atalar sözləri və məsəllərə yer verilmişdir. Əsərin sonuna, həmçinin o dövrdə türk xalqlarının yaşadıqları ərazilərin təsvirini verən ilk xəritə də əlavə olunmuşdur.



***Mahmud Kaşğarinin elmi fəaliyyəti barədə məlumat toplayın.***



***Mahmud Kaşğari***



***Molla Nəsrəddin***

Mövlanə Cəlaləddin Rumi, Yunis Əmrə, İmadəddin Nəsimi, Əlişir Nəvai və  Məhəmməd Füzuli dövrün ən məşhur türk-müsəlman şairləri olmuşdur.

Şifahi xalq yaradıcılığının ən böyük nümayəndəsi, türk hazırcavablığının, zəkasının parlaq timsalı **Xoca (Molla) Nəsrəddindir**. Molla Nəsrəddinin adı ilə bağlı Azərbaycanda da maraqlı lətifələr yaranmışdır.



**Molla Nəsrəddin haqqında nə bilirsiniz?**

***"Divani lüğət-it-türk"də türklərin yaşadığı ərazilərin təsvirini verən xəritə***

# Memarlıq və incəsənət

Orta əsrlərdə türk-müsəlman memarlığı öz üslubu və çoxcəhətliliyi ilə seçilirdi. Səlcuq dövlətində yaşamış memarlar çoxlu saray, karvansara, məscid, mədrəsə, türbə və günbəzlər inşa etmişdilər. Memarlığın inkişafı baxımından Səmərqənd, İstanbul, Təbriz kimi şəhərlər daha çox fərqlənirdi. Əmir Teymurun Səmərqənddə tikdirdiyi binalar öz möhtəşəmliyi ilə baxanları valeh edirdi. Teymurun qəbri üzərində inşa edilən Gur Əmir türbəsi Səmərqənd memarlığının şah əsəri hesab olunur. Səmərqənd rəsədxanasının tikilməsinə rəhbərlik etmiş Uluqbəy dövlət xadimi, astronom olmaqla yanaşı, həm də dövrünün görkəmli memarı sayılırdı.



*Səmərqənd, Uluqbəy rəsədxanasının girişi*

*Gur Əmir türbəsi*

Qütb minar



Qütbəddin Aybək



Memar Sinan

Hindistanda yaranmış türk dövlətləri dövründə hind-müsəlman mədəniyyəti yüksəlişdə idi. XIII yüzilliyin əvvəllərində Dehli sultanı Qütbəddin Aybək tərəfindən tikdirilən "Qütb minar" adlandırılan minarə bu gün də möhtəşəmliyini saxlamaqdadır. Hündürlüyü 73 metr olan dördsütunlu minarə qırmızı qumdaşı və ağ mərmərdən tikilmişdir.




**Osmanlı memarlığının inkişaf xüsusiyyətlərini izah edin.**

Osmanlı memarlığının əsas mərkəzlərindən biri İstanbul şəhəri idi. Burada türk memarları tərəfindən inşa edilən Çinili köşk, Topqapı, Fənərbağça və başqa saraylar bu gün də möhtəşəmliyi ilə şəhərə yaraşıq verir.

O dövrün ən məşhur memarlarından biri Sinan Xoca olmuşdur. Onun inşa etdiyi Şahzadə, Süleymaniyyə və Səlimiyyə məscidləri kimi memarlıq abidələri bu gün də əzəmətini saxlayır.

Bu dövrdə Çin memarları gözəl saraylar, evlər inşa edir, yuxarıya doğru qatlanmış, yan çıxıntılı tağları olan məbədlər-paqodalar tikirdilər.

Çində bir sıra əhəmiyyətli mədəni və texniki nailiyyətlər qazanılmışdı. İlk dəfə not yazısı ilə musiqi əsərləri yazılmış, balet meydana gəlmişdi. Barıt və metal top ixtira edilmişdi. Çində xüsusi gil növündən hazırlanmış möhkəm, yarımşəffaf, cingiltili qablar başqa ölkələrdə həvəslə alınırdı. Onlara çini qablar deyilirdi.

*Səlimiyyə məscidi*



**XI–XV yüzilliklərdə əldə edilən hansı mədəni-texniki nailiyyətlərdən indi də istifadə olunur?**



*Səlimiyyə məscidinin iç görünüşü*



Səlimiyyə məscidi Ədirnədə Osmanlı sultanı II Səlimin göstərişi ilə memar Sinan tərəfindən tikilmişdir. Memar Sinanın 90 yaşında inşa etdiyi və "ustalıq əsərim" adlandırdığı Səlimiyyə məscidi istər onun, istərsə də Osmanlı memarlığının ən əhəmiyyətli əsərlərindən biridir. Qapısındakı kitabəyə əsasən binanın inşasının 1568-ci ildə başlandığı məlum olur. Məscid 1575-ci ildə ibadətə açılmışdır.

Səlimiyyə açıq havalarda Rodop dağlarından və Uzunkörpünün Süleymaniyyə kəndindən görünür. Səlimiyyə məscidi və kompleksi 2011-ci ildə UNESCO-nun Ümumdünya irsi siyahısına salınmışdır.

# 23 AVROPA VƏ AMERİKA XALQLARININ MƏDƏNİYYƏTİ

**Universitet, humanistlər, kitab çapı, Kopernik, Şekspir, Qot üslubu, "Mona Liza", Mayya təqvimi**

Qərbi Avropada erkən orta əsrlərə nisbətən XI–XVI yüzilliklərdə təhsil, elm və incəsənət xeyli inkişaf etmişdi. XII yüzillikdə Avropada ilk ali məktəblər olan universitetlər meydana gəldi. Dərslər hər yerdə latın dilində keçirilirdi. Ona görə də avropalılar istədikləri universitetlərdə oxuya bilirdilər. Avropada ilk universitet İtaliyada, Boloniya şəhərində yaradılmışdı. Sonralar Fransa, İngiltərə və digər Avropa ölkələrində də belə təhsil müəssisələri yaradılmağa başlandı.

Sürətlə böyüyən və abadlaşan şəhərlər üçün daha çox savadlı adamlar tələb olunurdu. Bunun da nəticəsində şəhərlərdə zehni əməklə məşğul olan **ziyalılar** meydana gəlirdi. Kilsə təlimi ilə bağlı olmayan biliklərin meydana gəlməsi təsərrüfatın inkişafı ilə bağlı idi. XIII yüzillikdə İngiltərədə yaşamış **Rocer Bekon** Oksford universitetinin professoru idi. O deyirdi ki, biliyi müşahidə və təcrübənin köməyi ilə qazanmaq olar.

Bu dövrdə İtaliyada mədəni yüksəliş baş verirdi. Yeni mədəniyyətin nümayəndələrinin diqqətini daha çox insan və onun fəaliyyəti cəlb edirdi.

***Rafael Santi. "Afina məktəbi"***





Onları **humanistlər** adlandırırdılar. Müşahidə və təcrübələr aparan alimlər hadisələri izah etməyə, onların səbəblərini öyrənməyə çalışırdılar. Qədim Yunanıstan və Roma mədəniyyətinə böyük maraq göstərən humanistlər öz əsərlərini latın dilində deyil, ana dilində yazmağa üstünlük verirdilər. Yeni mədəniyyətin yarandığı dövr **İntibah dövrü** adlanır. İtaliyanın Florensiya şəhəri intibah mədəniyyətinin mərkəzinə çevrilmişdi.

Bu dövrdə elmi biliklər kağız üzərində əl ilə yazılaraq çoxaldılırdı. Bu isə kitaba olan tələbatı ödəmirdi. Alman alimi **Quttenberq 1445-ci ildə** çap üsulu ilə ilk kitabını buraxdı.

Bəşəriyyət tarixində ən böyük ixtiralardan biri olan kitab çapı təhsilin, elmin və ədəbiyyatın inkişafına təkan verdi.

*Quttenberqin ilk çap olunan "Bibliya"nın nəşri prosesində*



**XI–XVI yüzilliklərdə Avropada elm və təhsilin inkişafına təkan verən amilləri müəyyən edin.**



Orta əsrlərdə münəccimlik (astrologiya) və əlkimya kimi xüsusi elmlər tərəqqi etmişdi.

Münəccimlər sübut etməyə çalışırdılar ki, guya ulduzlara görə gələcəyi müəyyən etmək mümkündür. Əlkimyaçılar elə bir "sehrli daş" axtarırdılar ki, onun köməyi ilə hər hansı metalı qızıla çevirmək olsun. Münəccimlərin və əlkimyaçıların müşahidələri və təcrübələri astronomiya və kimyaya dair biliklərin toplanmasına kömək etmişdir.



***Nikolay Kopernik***



***Cordano Bruno***



***Qalileo Qaliley***

Böyük coğrafi kəşflərdən sonra daha da inkişaf edən coğrafiya elmi astronomiyanın da inkişafına şərait yaratdı. Orta əsrlərdə kainatın quruluşuna dair baxışlar səhvən Ptolomey təliminə əsaslanırdı. Bu təlimə görə Yer hərəkət etmir və dünyanın mərkəzində dayanır. Polyak alimi **Kopernik** Yerin həm öz oxu ətrafında, həm də Günəş ətrafında fırlandığını bildirmişdi. İtaliyalı alim **Bruno** isə kainatın sonsuz olduğunu göstərirdi. Göyə teleskopla baxan ilk alim venesiyalı **Qaliley** olmuşdur.

Qərbi Avropada elmin inkişafına müsəlman alimlərinin əsərlərinin böyük təsiri var idi. Bunlara misal olaraq İbn Sina, Əl Biruni və Nəsirəddin Tusini göstərmək olar.



Qalileo Qaliley kilsənin zəng qülləsində qurduğu müşahidə borusunun köməyi ilə gözlə görünən səma cisimlərini 30 dəfə böyütməyə nail olmuşdu. Onun kəşfləri Kopernik və Brunonun təlimini təsdiq etdi. Ancaq Romaya çağırılıb kilsə məhkəməsinə verilən alim işgəncə qorxusu altında "tövbə" etməyə məcbur oldu. Sonralar belə bir rəvayət yarandı ki, guya Qaliley Yerin hərəkətdə olduğuna inanmadığını bildirdikdən sonra ayağa qalxmış və demişdir: "Hər halda o fırlanır".



***Qalileyin Leonardo Donatoya teleskopunu göstərməsi***

# Ədəbiyyat

Qərbi Avropanın humanist yazıçıları feodal qaydalarını və kilsənin elmə qarşı apardığı mübarizəni pisləyir, daha ədalətli quruluş arzulayırdılar. İngilis yazıçısı **Tomas Mor** ölkədə baş verən ədalətsizlikləri tənqid edir, uydurduğu "**Utopiya adası**"nda hamının bərabər yaşadığını təsvir edirdi. "Utopiya" yunanca "olmayan yer" deməkdir.



*Tomas Mor*

*Qlobus teatrı*

Dahi ingilis yazıçısı **Uilyam Şekspirin** "Hamlet", "Otello", "Kral Lir" və s. bu kimi əsərləri ona dünya şöhrəti qazandırmışdı.



*Uilyam Şekspir*

Bu dövrdə Fransada, İspaniyada və digər Avropa ölkələrində yaşayıb yaradan şair və yazıçıların ədəbi əsərləri mədəniyyət nümunələrinin zənginləşməsinə xidmət edirdi.




**"Utopiya adası"nı necə təsəvvür edirsiniz?**




**Qərbi Avropa humanist yazıçılarının yaşadıqları dövrə münasibətləri necə idi?**




XVI yüzillikdə ingilis xalqı teatrı çox sevirdi. Bəzən kraliça Yelizaveta maskalanaraq tamaşaya gəlirdi. Uilyam Şekspirin bütün həyatı teatrla bağlı idi. O, əvvəllər Londondakı "Qlobus" teatrında aktyor işləmiş, sonra isə həmin teatrın sahiblərindən biri olmuşdu. Şekspir 37 pyes, habelə çoxlu şeir yazmışdı.

# Memarlıq və incəsənət

XI yüzillikdən başlayaraq Avropada böyük tikinti işləri aparılırdı. O dövrün inşaatçıları qədim Roma və Bizans memarlıq ənənələrinə əsaslanırdılar. Belə tikililərə **Roma üslublu tikililər** deyilirdi. XII yüzilliyin sonlarında Avropada qot memarlığı* deyilən memarlıq meydana gəldi. Şəhərlərdə, əsasən, bələdiyyə binaları, ticarət binaları, qonaq evləri və baş kilsələr qot üslubunda tikilirdi.




*Roma üslublu tikililər*



### * Qot memarlığı

*hündür çatma tağı olan divarlarında çoxlu iri pəncərələr yerləşən binaların tikilməsidir.*

Moskvada Qızıl meydandakı **Pokrov kilsəsi** orta əsrlər rus memarlığının zirvəsidir. Bu kilsəni Vasili Blajennı məbədi adlandırırlar.

İtaliya intibahının ən böyük xadimlərindən biri olan florensiyalı **Leonardo da Vinçi** dahi rəssam, ixtiraçı mühəndis, memar, heykəltaraş, musiqiçi və şair olmuşdur. Onun gənc,

*Pokrov kilsəsi*





*Leonardo da Vinçi*



*Leonardo da Vinçi "Mona Liza"*

şəhərli qadının portreti olan "Mona Liza" ("Cokonda") əsəri bütün dünyada məşhurdur.

İntibah dövrünün dahi xadimlərindən biri **Mikelancelo** heykəltaraş, rəssam, memar, hərbi mühəndis və şair olmuşdur. Heykəltaraş nəhəng bir mərmər parçasından hündürlüyü 5,5 metr olan "David" heykəlini yonmuşdu. Bu heykəl Florensiya şəhərinin himayədarı hesab olunur. Mikelancelo Romada Müqəddəs Pyotr kilsəsinin tikintisində də iştirak etmişdir.



*Mikelancelo Buonarroti*



*Mikelancelo. "David"*

Florensiyada yaşayan **Rafael** dövrünün görkəmli rəssamlarından biri sayılırdı.



*Rafael Santi*

O, Romada Müqəddəs Pyotr kilsəsinin tikintisinə rəhbərlik etmişdir. Rafaelin ən məşhur əsəri "Məryəm ana"dır.



*Rafael. "Məryəm ana"*

İntibah dövrünün dahi sənətkarları bəşəriyyəti bu gün də valeh edən nadir incilər yaratmışlar. İtaliya mədəniyyətinin təsiri altında Almaniya, İspaniya və Hollandiya rəssamları dünya incəsənətinə çox yeniliklər gətirmişlər.



**Mikelancelonun fəaliyyətinə həsr olunmuş "Dahi heykəltaraş" adlı esse yazın.**




*Müqəddəs Pyotr kilsəsinin daxili görüntüsü*



Leonardo da Vinçini bir rəssam kimi hər şeydən çox insan və onun hissləri maraqlandırırdı. O öz elmi kəşfləri və fərziyyələri ilə yaşadığı dövrdən bir neçə əsr irəliyə getmişdi. Leonardo paraşüt və vertolyotun, sualtı qayıq və dalğıc geyiminin quruluşunu işləyib hazırlamışdı. Xasiyyətcə müstəqil və məğrur adam olan Leonardo da Vinçi tez-tez sifarişçilərini və himayədarlarını dəyişirdi. O bütün ömrü boyu gəzərgi həyat keçirmiş və qürbətdə – Fransada vəfat etmişdir.

# Amerika xalqlarının mədəniyyəti

Amerikada yaşayan xalqlar içərisində **mayyalılar** əldə etdikləri mədəni nailiyyətlərə görə digərlərindən seçilirdi. Onların heroqliflərdən ibarət öz yazıları olmuşdur. Mayyalıların təqvimi qədim xalqların ən dəqiq təqvimlərindən biri idi. Təqvimin yaradılması riyaziyyatın inkişafı ilə bağlı idi. Mayyalılar hindlilərdən qabaq sıfır rəqəmindən istifadə etmişdilər. Mayya kahinləri planetlərin Günəş ətrafında

*Pilləli ehramlar*

hərəkətini hesablamışdılar. Onlar Günəşin və Ayın tutulmasını əvvəlcədən xəbər verə bilirdilər. Riyaziyyatın, astronomiyanın inkişafını onların **Çiçen-İtsada** ucaltdıqları pilləli ehramları, rəsədxanaları da sübut edir.



*Mayya alətləri*

*Mayya təqvimi*



**Asteklərin** paytaxtı Mexiko şəhərində məktəblər var idi. Burada varlı ailələrin uşaqları təhsil alırdı. Onlara əkinçilik, sənətkarlıq və hərbi iş öyrədilirdi. Astek ustalarının çaxmaqdaşından düzəltdikləri bıçaqlar, naxışlı gil qablar, mis sırğalar gözəl sənət əsərləri idi.

**İnklər** dağlıq ölkə olan Peruda yaşayırdılar. Ölkədə poçt rabitəsi yaxşı inkişaf etmişdi. Bunun üçün inklər keçilməz dağlarda tunellər tikir, dərin dərələr üzərində asma körpülər salırdılar. İnk sənətkarları pambıq parçadan naxışlı xalçalar hazırlayır, gil qablar düzəldirdilər. İnklərdə yaxşı təlim verən məktəblər var idi. Kolumbaqədərki Amerika xalqlarının mədəniyyəti orijinallığı və özünəməxsusluğu ilə seçilirdi. Bu mədəniyyət Avropa və Asiya xalqlarının mədəni təsiri olmadan yaradılmışdı.




**Mayyalıların və qədim misirlilərin mədəniyyətlərini müqayisə edin.**

*Astek döyüşçüsü*



# ƏDƏBİYYAT SİYAHISI


## Azərbaycan dilində

1. Asiya və Afrika ölkələrinin orta əsrlər tarixi. Nərgiz Axundova. Bakı, 2010.
2. Aydın Qasımlı. Türklər (Tarixi oçerklər). Bakı, 2012.
3. Eldəniz Məmmədov. Səlcuqlar. Dərs vəsaiti. Bakı: Mütərcim, 2015.
4. Əmirli İsrail. "Yaxın və Orta Şərq ölkələri feodalizm dövründə (III-XVII yüzilliklər)", Bakı, 2006.
5. Lev Qumilyov. Qədim türklər. Bakı, Gənclik, 1993.
6. "Monqolların gizli tarixi", AMEA, Bakı, 2011.
7. Muxtarova Əsməd. "Türk xalqlarının tarixi", "Adiloğlu", Bakı, 2013.
8. Orta əsrlər tarixi. S.Skazkinin ümumi redaktəsi ilə, Bakı,1988.
9. Telman Orucov. Ümumdünya tarixi. 3 cilddə. II kitab. Bakı, 2011.
10. Tofiq Mustafazadə. Ümumi tarix. I kitab. Bakı, 2009.

## Türk dilində

11. Akbaş, M. (2017). Reformasyon düşüncesinde eskatoloji: Martin Luther'de kurtuluş ve ahiret. Türkiye Din Eğitimi Araştırmaları Dergisi, 3, 23-30.
12. Akdes Nimet Kurat, "IV-XVIII yüzyıllarda Türk kavimleri ve devletleri", Türk Tarih Kurumu, Ankara, 1972.
13. Babürlü imparatorluğu'nun siyasi tarihi üzerine bir değerlendirme.
14. Bozkır İmparatorluğu Attila/Cengiz Han/Timur. Rene Grousset. Çeviren: Or. M.Reşot Uzmen
15. Dinçer Koç, "Altın Orda tarihi", İstanbul Üniversitesi, 2001.
16. Doğu Avrupa türk tarihi. Prof. Dr. Mualla Uydu Yücel
17. Ekber şah döneminde Hindistan. H.Hilal Çağlayan. Ankara, 2005.
18. Erdoğan Merçil, "Qazneliler devleti tarihi", Türk Tarih Kurumu, Ankara, 1989.
19. Erdoğan Merçil, "Müslüman Türk Devletleri Tarihi, Türk Tarih Kurumu, Ankara, 2006.
20. Fatma Çapan, Baran Güvenç, "Kavimler göçü ve Batı Roma imperatorluğunun çöküşü", "21. Yüzyılda Eğitim ve Toplum degisi", İstanbul, 2017.
21. Göktürkler. Dr. Öğretim Üyesi Ali Ahmetbeyoğlu
22. Göktürk devleti diplomasisi (552-630). Çiğdem Şahin. Karadeniz, 2018.
23. Hans Robert Roemer. Timurlular. İstanbul, 1974.
24. Henri Pirenne, "Ortaçağ Avrupasının Ekonomik ve Sosyal tarihi", İstanbul, 2018.
25. Hindistan'da Babür imparatorluğunun kuruluş dönemi: Zahirüddin Muhammed Babür. DTCF Dergisi 57.1 (2017)
26. İslam Ansiklopedisi. Cilt 3. Ankara savaşı.
27. İslam Ansiklopedisi. Cilt 4. Babürlüler.
28. İslam Ansiklopedisi. Cilt 9. Delhi sultanlığı.
29. İslam Ansiklopedisi. Cilt 41. Timurlular.
30. İslam Ansiklopedisi. Cilt 42. Uygurlar.
31. İzzet Çivgin. "Ortaçağ Tarihi, Ankara, 2008.
32. J.Hammer. Büyük Osmanlı tarihi (10 ciltte). İstanbul, 1982-1990.
33. J.M.Roberts. Avrupa Tarihi, İstanbul, 2016.
34. Kürşat Yıldırım. "Hun tarihi", İstanbul Üniversitesi, 2001.
35. Muammer Gül. "Ortaçağ Avrupa Tarihi, İstanbul, 2009.
36. Mualla Uydu Yücel. "Doğu Avrupa tarihi", İstanbul Üniversitesi, 2001.
37. Mualla Uydu Yücel. "Moğollar tarihi", İstanbul Üniversitesi, 2001.
38. Müslüman-türk devletleri tarihi. Prof. Dr. Erdoğan Merçil. İstanbul, 2013.
39. Orta Asya türk tarihi. Prof. Dr. Barthold. Ankara, 2004.
40. Orta çağ Avrupa tarihi. Muammer Gül. İstanbul, 2009.
41. Orta Çağ Tarihi. İzzet Çivgin. Ankara, 2008.
42. "Ortaçağda Dünyada bilim, Teknoloji ve Sosyal değişme", İstanbul, 2009.
43. "Orta Doğu Araştırmalar Dergisi", Elazığ, 2004.
44. Selçuklu İmparatorluğu tarihi. Yazan: Enver Behnan Şapolyo. Ankara, 1972.
45. Şerif Baştav. "Avrupa Hunları", Ankara Üniversitesi, 2000.
46. Timurun Günlüyü. Tüzükati Timur. Sahibkıran Emir Timur Muhammed Tarağay Bahadır oğlu
47. Timurlular devleti (1370-1507). Prof. Dr. Abdulhaluk Mehmet Çay. Ankara, 2009.
48. Turkish Translation of Martin Luther's "95 Theses", translated by Asst. Prof. Dr. Kaan H.Ökten, Maltepe University, İstanbul.
49. Peter B Golden, "Türk halkları tarihine giriş", İstanbul, 2012.
50. Protestan reformunun Almanyada ortaya çıkış süreci. Anasay yayınları, 2020.
51. Reformasyon Avrupası 1517-1559.
52. Rene Grousset. "Bozkır imperatorluğu – Attila/Cengiz han/Timur", İstanbul, 1980.
53. Susan Vays Bauer. Dünya tarihi, Orta çağ, İstanbul, 2015.
54. Z.V.Toğan. Ümumi türk tarihine giriş. İstanbul,1946.

## Rus dilində

55. Артомонов М.И. История хазар. Ленинград, 1962 г.
56. Великая степь в античных и византийских источниках. Алматы, 2005
57. Великие империи мира. Москва, 2011.
58. Все войны древности. Москва, 2009.
59. Всемирная история. В 24-х томах. Том 1-2. Минск, 1999.
60. История востока. В. 6 т. Т. 2. Восток в средние века. М. 2002, 716 с.
61. История культуры народов мира. В 10-ти книгах. Москва, 2005.
62. История средних веков.Т.1,Москва, 1989.

